QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Mart 2018 № 3 (1090)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Akademik Əhəd Yaqubovun 110 illiyinin qeyd edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2018-ci ilin may ayında görkəmli Azərbaycan alimi, iki dəfə SSRİ Dövlət mükafatı laureatı, geoloiya-mineralogiya elmləri doktoru, professor, Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü Əhəd Ələkbər oğlu Yaqubovun anadan olmasının 110 illiyi tamam olur.

Neft-qaz geologiyası və vulkanologiya sahəsi üzrə qiymətli tədqiqatlar müəllifi akademik Əhəd Yaqubov Azərbaycanın palçıq vulkanlarının kompleks öyrənilməsinin təşkilatçısı kimi şöhrət tapmış, onların ilk atlası və xəritələrinin tərtibinə rəhbərlik etmişdir. Xəzər dənizi neft yataqlarından bir çoxunun kəşfi alimin adı ilə bağlıdır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, ölkədə geologiya elminin inkişafına mühüm töhfələr vermiş və yüksəkixtisaslı kadrların hazırlanmasında təqdirəlayiq xidmətlər göstərmiş akademik Əhəd Yaqubovun anadan olmasının 110-cu ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Milli Elmlər Akademiyası akademik Əhəd Yaqubovun 110 illiyi ilə bağlı tədbirlər planını hazırlayıb həyata keçirsin.
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 29 mart 2018-ci il*

## Novruz bayramı şənliyi

Martın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Həmkarlar İttifaqı Komitəsinin təşəbbüsü və təşkilatçılığı ilə Baharın gəlişi və ilaxır çərşənbəyə həsr olunan bayram şənliyi keçirilib. Bayram şənliyində ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər. Bayram şənliyində əvvəlcə tələbələrin Novruz bayramına həsr etdikləri rəsm sərgisinə və bayram xonçalarına baxış keçirilib.





Bayram şənliyində Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin tələbələrinin və Bakı şəhəri, Nərimanov rayonu 47 nömrəli tam orta məktəbin şagirdlərinin ifasında "Arşın mal alan" tamaşası təqdim edilib. Tamaşa iştiakçılar tərəfindən maraqla qarşılanıb. Milli geyimdə olan tələbələrin və şagirdlərin musiqi sədaları altında ifa etdikləri rəqslər, bayramın rəmzlərindən və adətlərindən olan səməni, xonça, eyni zamanda Novruz personajları Kosa, Keçəl və Bahar qızın şən zarafatları tədbir iştirakçılarına xoş ovqat bəxş edib. Xalq artisti Zabit Nəbizadənin ifasında səslənən mahnılar tədbirə xüsusi rəng qatıb. Qeyd edək ki, bayram tədbirinin ərsəyə gəlməsində Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin müəllim və tələbələri yaxından iştirak ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək tədbirin təşkilatçılarına təşəkkür edib, müəllim və tələbələri bayram münasibətilə təbrik edərək onlara cansağlığı və uğurlar arzulayıb.

Bədii-musiqili hissədən sonra universitetin həyətində Novruz tonqalı alovlandırılıb. Tələbə-gənclər tonqal ətrafında dövrə vuraraq rəqs edib, maraqlı konsert proqramı ilə çıxış ediblər. Bayram şənliyi universitetin kollektivinin böyük sevincinə səbəb olub.

**"Gənc müəllim"**

## ADPU-da Yeni Azərbaycan Partiyasına yeni qəbul edilən müəllim və tələbələrə üzvlük vəsiqələri təqdim edilib

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasına (YAP) yeni qəbul edilən müəllim və tələbələrə üzvlük vəsiqələri təqdim edilib. Bununla bağlı keçirilən tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, rektorun müşaviri, professor Vilayət Əliyev, YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının İdarə Heyətinin üzvləri və partiyaya yeni qəbul edilən müəllim və tələbələr iştirak ediblər. Qeyd edək ki, tədbirdə Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin 12 nəfər müəlliminə, 31 nəfər tələbəsinə, Riyaziyyat və informatika fakültəsinin tələbələrinə üzvlük vəsiqələri təqdim edilib.



Toplantını YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının İdarə Heyətinin sədri, professor Himalay Qasımov açaraq partiyanın yaranma tarixi, partiyanın bünövrəsini qoymuş ümummilli lider Heydər Əliyevin bu sahədəki fədakarlığından, eyni zamanda YAP-ın Sədri, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və YAP-ın Sədr müavini, Birinci vitse-prezident Mehriban xanım Əliyevanın bu gün respublika üçün həyata keçirdikləri işlərdən danışıb. Professor H.Qasımov qeyd edib ki, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin kollektivi partiyanın fəaliyyətində fəal iştirak edir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək böyük həvəs və inamla partiyaya yeni qəbul olunan tələbə-gəncləri və müəllimləri təbrik edib, onlara uğurlar arzulayıb. Qeyd edib ki, ölkəmizin çox əlamətdar və ciddi hadisə ərəfəsində olduğu dönəmdə gənclərin partiyaya üzv olmaları təqdirəlayiqdir. Rektor gənclərə müraciət edərək bildirib ki, ulu öndər Heydər Əliyev dühasından ruhlanaraq İlham Əliyev ideyalarını uğurla həyata keçirmək üçün bizim gənclərə böyük ümidlərimiz var. Prezident seçkisi yaxınlaşır və hər birimiz kimi sizin də bu seçkidə fəal iştirak edəcəyinizə inanırıq.

Sonda üzvlük vəsiqələri təqdim edilib.

# ADPU-nun Pedaqoji Forumunun "Biliyin qiymətləndirilməsinin fəlsəfəsi" mövzusunda növbəti dinləməsi

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji Forumunun (PF) növbəti dinləməsi keçirilib. Tədbirdə tanınmış və nüfuzlu təhsil eksperti, Əməkdar elm xadimi, professor Şahlar Əsgərovun "Biliyin qiymətləndirilməsinin fəlsəfəsi" mövzusunda məruzəsi dinlənilib. Dinləmədə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, professor-müəllimlər, tələbələr, təhsil ekspertləri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və təhsil sahəsindən yazan jurnalistlər iştirak ediblər.

ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov tədbiri giriş sözü ilə açaraq bildirib ki, Şahlar Əsgərov 1970-ci ildə "Alçaq




enerjili civə ionları ilə metalların tozlanmasının tədqiqi" mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi, 1992-ci ildə isə «Toxunma sərhədlərinin qeyri-bircinslik dərəcəsinin metal-vakuum, metal-yarımkeçirici strukturlarının elektrofiziki xassələrinə təsiri» mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi alıb. Bakı Dövlət Universitetində (BDU) müəllim, baş müəllim, dosent, dekan müavini işləyib. 1994-1995-ci illərdə BDU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru vəzifəsində işləyib. 1995 və 2000-ci illərdə Milli Məclisin deputatı seçilib. 2000-2005-ci illərdə parlamentin Elm və təhsil məsələləri daimi komissiyasının sədri olub. BDU-nun Fizika fakültəsinin professorudur. 250-dən çox elmi məqalənin, 11 kitabın, 3 monoqrafiyanın müəllifidir. Alimin əsərləri özünün yüksək ideya məzmunu, təhlil səviyyəsi, aktuallığı, problemlərə yanaşma üslubu, milli-mənəvi dəyərləri önə çəkməsi ilə diqqəti cəlb edir. Respublikamızın ictimai-siyasi həyatındakı fəaliyyətinə görə "Şöhrət" ordeni ilə təltif edilib, elm və təhsil sahəsində xidmətlərinə görə "Əməkdar elm xadimi" fəxri adına layiq görülüb. Professor Ş.Əsgərov xalqımızın beynəlxalq miqyasda tanınan alimlərindən biridir. Elmi-pedaqoji kadrların hazırlanmasında səmərəli fəaliyyət göstərir. Mediada təhsil sahəsi, eləcə də mənəvi-əxlaqi dəyərlərlə bağlı ardıcıl olaraq maraqlı yazılarla çıxış edir.

"Biliyin qiymətləndirilməsinin fəlsəfəsi" mövzusunda təqdimatla çıxış edən professor Ş.Əsgərov öncə təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Bildirib ki, təhsil ilahi gücə, qüvvəyə malikdir. Təhsilin ali məqsədi gənclərlimizə düzgün qərarlar qəbul etməyii öyrətməkdir. Yalnız bu halda onlar həyatda özlərini təsdiq edə bilər, cəmiyyət üçün layiqli vətəndaş, yüksək səviyyəli mütəxəssis kimi yetişə bilərlər. Son illər təhsil sahəsində böyük uğurlar qazanılıb. Təhsil sistemi yeni və müasir məktəb şəbəkələri ilə əhatə olunub. Məktəblər İKT vasitələri ilə təmin edilib. Bu uğurların qazanılmasında Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və Birinci vitse-prezident Mehirban xanım Əliyevanın diqqət və qayğısı böyük rol oynayıb. Məruzəçi qeyd edib ki, ürəyi maarifləndirmədən zehni marifləndirən təhsil, yaxşı təhsil hesab edilmir. Qiymət- şagirdin bilik səviyyəsi haqqında müəllimin rəqəmlərlə ifadə olunmuş rəyidir. Qiymət-tələbənin təlim fəaliyyətinin nəticələrinin göstəricisidir. Qiymət - mövzunun, fənnin, kursun məmnisəmə dərəcəsinin faiz göstəricisinin rəqəmlərlə ifadəsidir. Qiymət-bildiyimizin bilməli olduğumuza olan nisbətidir . "Başa düşmək" mənimsəmənin alt səviyyəsidir. Başa düşmək pedaqoji meyar deyil. "Mənimsəmə"-pedaqoji meyardır. Dünyagörüşünü dəyişə bilən elmi nəticə paradiqma adlanır. Təhsilə yanaşmada yeni modellər, meyarlar lazımdır, paradiqmaları dəyişmək vacibdir. Tələbələr üçün yeni qiymətləndirmə cədvəlləri yaradılmalı, bu istiqamətdə tədqiqatlar aparılmalı, çoxballı sistemdən birballı sistemə keçilməlidir.

Professor Əzizxan Tanverdiyev, professor Fərrux Rüstəmov, professor İramin İsayev, dosent Şahin Pənahov, dosent Yusif Alıyev, dosent Zahirəli Sadıxov, dosent Fəxrəddin Yusifov, təhsil ekspertləri, fəlsəfə doktoru Etibar Əliyev, Nadir İsrafilov, Məktəbguşəsi.az saytının baş redaktoru Məzahir Məmmədov təqdimatın geniş və əhatəli olduğunu bildirərək mövzu ilə bağlı öz fikir və təkliflərini bölüşüblər..

Tədbirdə təhsil səviyyələri, müəllim-şagird, müəllim-tələbə münasibətləri, repetitorluq fəaliyyəti, qiymətləndirmənin fəlsəfəsi, məktəbin inkişafının perspektivləri, nəzəriyyəsi və praktikası, müasir universitetin yaradılması, təhsilin idarə edilməsi, xaricdə təhsil, insan inkişafı konsepsiyası və pedaqoji təhsilin problemləri ilə bağlı maraqlı fikir mübadiləsi aparılıb, iştirakçıların çoxsaylı sualları cavablandırılıb.

Tədbirə yekun vuran ADPU-nun rektoru, professor Cəfər Cəfərov maraqlı və məzmunlu təqdimata, eləcə də universitetdə həyata keçirilən islahatlara, yeniliklərə verdiyi dəstəyə görə professor Ş.Əsgərova təşəkkür edib və belə tədbirlərin fikir və təcrübə mübadiləsi aparmaq baxımından mühüm əhəmiyyət kəsb etdyini vurğulayıb.

**Könül Nəzərova**

# Qara Qarayevin 100 illik yubileyinə həsr olunmuş elmi konfrans

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə dahi bəstəkar Qara Qarayevin 100 illik yubileyinə həsr olunmuş elmi konfrans keçirilib. Konfransda ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, fakültənin müəllim və tələbələri, respublikamızın tanınmış incəsənət xadimləri iştirak ediblər.



Konfransda Azərbaycan Bəstəkarlar İttifaqının katibi, Əməkdar incəsənət xadimi, professor Zemfira Qafarova "Qara Qarayevin musiqi-ictimai fəaliyyəti" mövzusunda məruzə ilə çıxış edib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev ötən il oktyabrın 17-də "Görkəmli Azərbaycan bəstəkarı Qara Qarayevin 100 illik yubileyi haqqında" Sərəncam imzalayıb. Sərəncamda qeyd edilir ki, 2018-ci ilin fevral ayında Azərbaycan mədəniyyətinin görkəmli nümayəndəsi, böyük bəstəkar, tanınmış alim-pedaqoq və ictimai xadim, SSRİ xalq artisti, Sosialist Əməyi Qəhrəmanı, SSRİ və Azərbaycan Dövlət mükafatları laureatı, akademik Qara Əbülfəz oğlu Qarayevin anadan olmasının 100 illiyi tamam olur.



Qara Qarayev Azərbaycan xalqının bəşər mədəniyyətinə bəxş etdiyi özünəməxsus nadir fitri istedada malik şəxsiyyətlərdəndir. Novator sənətkar kimi o, uzunəsrlik qədim milli musiqi irsinin ənənəvi klassik və ən müasir musiqi formalarıyla son dərəcə ahəngdar vəhdətində çox sayda monumental əsərlər meydana gətirmişdir. Həyat, insan və zaman haqqında dərin fəlsəfi düşüncələri bütün vüsəti ilə yüksək professional səviyyədə əks etdirən həmin ecazkar sənət nümunələri daim əxlaqi-mənəvi kamilliyə çağırır. Professor A.Zamanov qeyd edib ki, bugünkü elmi konfrans həmin Sərəncama və Təhsil Nazirliyinin müvafiq əmrinə uyğun olaraq keçirilir.

Bəstəkar, Əməkdar incəsənət xadimi, sənətşünaslıq üzrə fəlsəfə doktoru, professor Elnarə Dadaşova "Qara Qarayevin pedaqoji fəaliyyəti" mövzusunda danışıb, bəstəkarın "iki prelyüd"əsərini ifa edib. Sənətşünaslıq üzrə fəlsəfə doktoru, Bakı Musiqi Akademiyasının Musiqi nəzəriyyəsi kafedrasının müdiri, professor Könül Nəsirova "Qara Qarayevin baletləri"ni, III tədris ili tələbəsi Könül Məmmədova "Yeddi gözəl" baletindən vals ifa edib.

Pedaqogika üzrə elmlər doktoru, professor Minarə Dadşova "Qara Qarayevin yaradıcılığında caz" mövzusunda çıxış edib, "Eskiz"əsərini ifa edib.

Musiqi və onun tədrisi metodikası kaefrasının müəllimi Gülarə Bakıxanova "Qara Qarayevin kino musiqisi" mövzusunda çıxış edib. Əməkdar artist Rəna Əliyeva Viktoriya Zaytsevanın müşayiəti ilə bəstəkarın "Mən sizi sevirdim", "Gürcüstan dağlarında" romanslarını ifa edib.

Maraqlı və rəngarəng konsert proqramı hamıda xoş təəssürat yaradıb.

Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev çıxışında bildirib ki, belə tədbirlər müəllim və tələbələrin mənəvi cəhətdən zənginləşmələrində, onların musiqi zövqünün formalaşmasında mühüm rol oynayır.

Sonda Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova çıxış edərək tədbirin ərsəyə gəlməsində əməyi keçən hər kəsə təşəkkür edib və onlara uğurlar arzulayıb.

# II tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin yekununa və elmi-tədqiqat təcrübəsinin başlanmasına həsr olunmuş konfrans

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) II tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin yekununa və elmi-tədqiqat təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirilib. Konfransda ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov iştirak ediblər.

Konfransı giriş sözü ilə açan Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov magistrantları qarşıdan gələn Novruz bayramı münasibətilə təbrik edib, onlara xoş günlər, yaradıcılıq uğurları arzulayıb. Qeyd edib ki, magistrantlar üçün elmi-tədqiqat təcrübəsi tədris prosesinin tərkib hissədir. ADPU-nun rəhbərliyi elmi-tədqiqat təcrübəsini yüksək səviyyədə təşkil etmək üçün lazımi əməli tədbirlər həyata keçirir. Elmi fəaliyyətlə məşğul olmaq insandan intellekt səviyyəsi tələb edir. Elmi fəaliyyətlə məşğul olmaq çətin, məsuliyyətli, eyni zamanda şərəflidir. Magistrantlar elmi fəaliyyətə daha geniş cəlb edilməli, onlara elmi yaradıcılıq və tədqiqatçılıq vərdişləri, müasir elmi metodologiyalardan və elmi ədəbiyyatdan istifadə etmək bacarıqları aşılanmalıdır. Professor A.Zamanov çıxışının sonunda magistrantlara elmi-tədqiqat təcrübəsində uğurlar arzulayıb.





Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov II tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin yekunu barədə məlumat verib. Bildirib ki, əyani təhsilalma forması üzə II tədris ili magistrantları fevral ayının 16-dan mart ayının 16-dək universitetin ixtisas kafedralarında 4 həftə elmi-pedaqoji təcrübə keçiblər. Elmi-pedaqoji təcrübədə 19 ixtisas, 20 ixtisaslaşma üzrə 415 nəfər magistrant iştirak edib. Elmi-pedaqoji təcrübə mütəşəkkil və səmərəli keçib və uğurla yekunlaşıb.

Öz çıxışında həm də elmi-tədqiqat təcrübəsinin təşkili barədə məlumat verən professor İ.Bayramov bildirib ki, təsdiq edilmiş tədris planına əsasən əyani təhsilalma forması üzə II tədris ili magistrantlarının elmi-tədqiqat təcrübəsi mart ayının 16-dan aprel ayının 12-dək universitetin ixtisas kafedralarında keçiriləcək. Elmi-tədqiqat təcrübəsində 9 ixtisas üzrə 412 nəfər II tədris ili magistrantı iştirak edəcək. Təcrübə I növbədə təşkil olunacaq.

Professor Azadxan Adıgözəlov, professor Zahid Xəlil, professor İramin İsayev çıxış edərək elmi-tədqiqat təcrübəsinin daha səmərəli təşkil edilməsi ilə bağlı təkliflərini səsləndiriblər.

Konfransda çıxış edən magistrantlar onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

## ADPU-nun rektoru, professor Cəfər Cəfərov Qafqaz Universitetlər Birliyinin VII Konqresində iştirak edib

Məlumat üçün bildiririk ki, 16 mart 2018-ci ildə İstanbulda yerləşən Maltepe Universitetində Qafqaz Universitetlər Birliyinin (KÜNİB) VII Konqresi keçirilib.

Konqres KÜNİB rəhbəri, professor Ramazan Korkmaz, Maltepe Universitetinin rektoru, Təbriz Universitetinin rektoru, Azərbaycan Dillər Universitetinin rektoru, Gürcüstan Kutaisi Universitetinin rektoru və Rusiya Elmlər Akademiyasının nümayəndəsinin açılış nitqi ilə başlayıb.

Açılış nitqindən sonra Türkiyə Respublikasının Dənizçilik, Nəqliyyat və Rabitə naziri Ahmet Arslan Fəxri Doktor adı ilə təltif olunub, yeni üzvlərin KÜNİB-ə` üzvlük mərasimi keçirilib. Belə ki, 5 ölkədən 29 ali təhsil müəssisəsi yeni üzv kimi konqresdə iştirak edib.

Günün ikinci yarısı "Qafqaz Birgə Elm Şəbəkəsi" mövzusunda müzakirələr aparılıb, sonra rektorların toplantısı keçirilib.

Qonaqlar arasında Türkiyə Respublikasının Təhsil naziri İsmet Yılmaz, Dənizçilik, Nəqliyyat və Rabitə naziri Ahmet Arslan, millət vəkilləri, müxtəlif dövlət qurumlarının nümayəndələri, təşkilata üzv ali təhsil müəssisələrinin rektor və əməkdaşları, kütləvi informasiya vasitələrinin nümayəndələri iştirak ediblər.

Qeyd edək ki, 14 ölkədən 160 ali təhsil müəssisəsi 2009-cu ildən fəaliyyət göstərən Qafqaz Universitetlər Birliyinə (KÜNİB) üzvdür.




## "18 Mart-Çanaqqala zəfəri" adlı tədbir

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Çanaqqala zəfərinin 103-cü ildönümünə həsr edilmiş "18 Mart-Çanaqqala zəfəri" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Türkiyənin Azərbaycandakı Səfirliyinin Təhsil müşaviri Abdulqafur Büyükfırat, Mədəniyyət müşaviri İrfan Cifçi, Türkiyə Əməkdaşlıq və İnkişaf İdarəsinin (TİKA) təmsilçiləri, universitetin müəllim və tələbələri iştirak ediblər. Qeyd edək ki, tədbir ADPU-da təhsil alan türkiyəli tələbələrin İdarə Heyətinin təşəbbüsü və təşkilatçılığı ilə keçirilib. Toplantıda ilk olaraq Çanaqqala şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Türkiyənin və Azərbaycanın dövlət himnləri səsləndirilib.

ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov tədbiri giriş sözü ilə açaraq bildirib ki, bütün Türk dünyasının tarixinə böyük qəhrəmanlıq və hərbi şücaət salnaməsi kimi daxil olmuş Çanaqqala zəfərindən 103 il keçir. Çanaqqala döyüşü 1915-1916-cı illərdə Osmanlı dövləti ilə İttifaq dövlətləri (İngiltərə, Fransa və s.) arasında dənizdə və quruda aparılan nəhəng bir döyüş olmuşdur. Həmin dövrdə İttifaq dövlətləri Osmanlı dövlətinin paytaxtı İstanbulu işğal edərək boğazları ələ keçirmək və bununla da Rusiya üçün etibarlı bir ticarət və hərbi yol açmaq istəyirdilər. Eyni zamanda onlar Almaniyanın müttəfiqlərindən biri olan Osmanlını zəiflətmək məqsədilə Çanaqqalanı hədəf seçmişdilər. Çünki Çanaqqalanın işğal edilməsi bütünlükdə Osmanlı dövlətinin tamamilə məhv edilməsi demək idi. Yəni bu döyüş faktiki olaraq Osmanlı dövləti üçün bir ölüm-dirim məsələsi idi. İttifaq dövlətləri canlı qüvvə və texnika sarıdan böyük üstünlüyə malik olsalar da, Çanaqqalanı ələ keçirə bilməmiş, döyüş sonucda Osmanlı qüvvələrinin qələbəsi ilə nəticələnmişdir. Məşhur Çanaqqala döyüşü Osmanlı dövlətinin möhtəşəm qələbəsi kimi tarixə düşmüş, hər bir vətəndaşın xatirəsində qalmışdır. Çanaqqala zəfəri Türk xalqının, Türk millətinin tarixin ən çətin və mürəkkəb dövrlərində öz gücünü, iradəsini ortaya qoymaq bacarığını bütün dünyaya göstərmişdir. Bu savaş həm də Türk Qurtuluş Döyüşünə böyük təsir göstərmişdir. Məhz buna görə Türkiyə Respublikası qurulduqdan sonra ingilis və fransız donanmalarının geri çəkilməyə məcbur edildiyi 18 mart tarixi Çanaqqala Şəhidlərini Xatırlama Günü olaraq elan edilmişdir. Düşmən tərəfi olan Antanta birliyi üçünsə bu döyüş hərbi bacarıqsızlıq və fəlakət simvolu olaraq qəbul edilmişdir.






Professor A.Zamanov çıxışı zamanı deyib ki, bütün Türk dünyasının parlaq hərbi-siyasi istedadından, məharətindən böyük qürur və fəxr duyduğu Mustafa Kamal Atatürk bu döyüşdə öz üzərinə düşən hərbi vəzifələri layiqincə yerinə yetirmişdir. Mustafa Kamal Atatürk elə döyüşlərin ilk günlərindən öz parlaq hərbi istedadını üzə çıxarmış və məşhurlaşmışdır. Bu fakt həm də Mustafa Kamal Atatürkün Türk xalqının milli lideri kimi ortaya çıxmasına həlledici təsir göstərmişdir. Böyük tarixi köklərə əsaslanan Azərbaycan-Türkiyə münasibətləri yüksək inkişaf yolundadır. Ümummilli liderimiz Heydər Əliyevin dediyi kimi, "Biz bir millət, iki dövlətik".

Türkiyənin Azərbaycandakı Səfirliyinin Mədəniyyət müşaviri İrfan Cifçi, türkiyəli tələbələrin İdarə Heyətinin sədri Hakan Köseyi və başqaları çıxış edərək Çanaqqala zəfərinin 103-cü ildönümünə həsr edilmiş tədbirin təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, iki qardaş xalqın həmrəy olmasından qürur duyduqlarını vurğulayıblar.

Toplantıda Türk xalqının böyük tarixi şəxsiyyətlərinin bu günümüzlə səsləşən fikirləri və "Çanaqqala" şeiri səsləndirilib, "Harmandalı Zeybek" rəqsi ifa edilib, Çanaqqala zəfəri ilə bağlı videoçarx və Bakı Türk Orta Məktəbinin şagirdlərinin xorunun ifasında musiqilər təqdim edilib.

Görkəmli türk sənətçisi Yağız Ozanın ifa etdiyi mahnılar iştirakçılarda ruh yüksəkliyi yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Nigar Abbasova**

## "Həyatla oyun" tamaşasının nümayişi

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 15 sentyabr 2017-ci il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan gəncliyi 2017-2021-ci illərdə" Dövlət Proqramının 5.2.1-ci bəndində gənclərin sağlam həyat tərzi ilə bağlı maarifləndirilməsi, biliklərinin artırılması və davranışlarının təkmilləşdirilməsi aidiyyəti təşkilatların üzərinə vəzifə kimi qoyulub.

Gənclərin bu sahədə maarifləndirilməsi məqsədilə Gənclər və İdman Nazirliyi, Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komiyyasının təşəbbüsü və dəstəyi ilə Bakı Uşaq Teatrının "Həyatla oyun" tamaşasının mart ayı ərzində səkkiz universitetdə nümayişi planlaşdırılır. Artıq tamaşa Bakı Dövlət Universiteti (BDU) və Azərbaycan Dillər Universitetində (ADU) nümayiş olunub. Martın 15-də isə tamaşa Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) nümayiş olunub.

Tamaşalardan əvvəl Gənclər və İdman Nazirliyinin əməkdaşı



Fərid Qurbanzadə, Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komiyyasının əməkdaşı Vasif Quliyev, tamaşanın rejissoru İntiqam Soltan, əsərin müəllifi Arzu Soltan çıxış edərək bildiriblər ki, tamaşanın əsas məqsədi bütün insanları bəşəriyyətin ən böyük problemlərindən biri olan narkomaniyaya, QİÇS-ə qarşı mübarizəyə çağırmaq və yeni metodlar vasitəsilə məlumatlandırmaqdır. Maarifləndirmə funksiyasını yerinə yetirən tamaşa gənclərdə narkomaniyanın doğurduğu faciələr, QİÇS və bir sıra başqa qorxunc xəstəliklərin yayılması yolları haqqında aydın təsəvvür yaradır. Tamaşanın nümayişi gənclərin sağlam həyat tərzi seçmələri üçün çox təsirli təbliğat vasitəsidir.

Tamaşada hadisələr real həyatdan götürülüb. Hadisələr əsasən bir qrup tələbə arasında cərəyan edir. Universitet tələbəsi olan Duman narkotika aludəçisidir. Atası tərəfindən atılmış Nicat problemlərini unutmaq üçün dostu Dumanın məsləhəti ilə narkotikadan istifadəyə başlayır. Getdikcə onun vəziyyəti ağırlaşır. Oğlunun narkoman olduğunu öyrənən Nicatın anası infarkt keçirir. Universitetdə təlimçi tərəfindən narkomaniya və QİÇS haqqında maarifləndirilən tələbələr QİÇS-dən analiz verməyi qərara alırlar. Analizin cavabları alındıqdan sonra Nicatın QİÇS-ə yoluxduğu məlum olur. Bütün bu hadisələrin mərkəzində dayanan Dumanın narkoman olmasına səbəb isə uşaqlıqdan valideynləri tərəfindən düzgün başa düşülməməsi, bu haqda maarifləndirilməməsidir. Valideynlərinin yalnış münasibəti isə Dumanın pis yola düşməsinə təkan verir. Hətta narkoman qardaşını pis vəziyyətdə qoyub gedən Naza xanım oğlu Dumanı da qoruya bilmir. Tamaşa yeniyetmələr və böyüklər üçün nəzərdə tutulub.

Tamaşa ADPU-nun tələbə-gəncləri tərəfindən maraqla qarşılanıb.



# "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxuların açılış mərasimi

Martın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Beynəlxalq Assosiasiya" İctimai Birliyinin Humanist Pedaqogika Beynəlxalq Mərkəzinin, ADPU-nun və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxular öz işinə başlayıb. ADPU-nun rektoru, professor Cəfər Cəfərov "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxuların təşkili barədə müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən tədbirin yüksək səviyyədə keçirilməsi məqsədi ilə 22 nəfərdən ibarət Lokal Təşkilat Komitəsi yaradılıb. Oxuların müəllifi müasir pedaqogikanın əfsanəsi, Beynəlxalq Humanist Pedaqogika Mərkə-





zinin fəxri prezidenti, Rusiya Təhsil Akademiyasının akademiki, Rusiya Federasiyası Hökumətinin təhsil sahəsində iki dəfə mükafatçısı, psixologiya elmləri doktoru, professor, yazıçı Şalva Amonaşvilidir. Qeyd edək ki, 3 gün davam edəcək oxularda respublikamızın və xarici ölkələrin humanist pedaqogika sahəsində çalışan tanınmış və nüfuzlu alim-mütəxəssisləri, gənc müəllimlər iştirak edirlər.

Plenar iclaşın açılışında Azərbaycanın Dövlət Himni və Humanist Pedaqogikanın Himni səsləndirilib.

Rektor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxularda müxtəlif xarici ölkələrdən 320 nəfər iştirak edir. Qeyd edib ki, bu gün universitetimizin həyatında əlamətdar bir gündür. Belə ciddi və nüfuzlu heyətdə beynəlxalq oxuların keçirilməsi bizim üçün çox şərəflidir. Pedaqogika elminin mahiyyətində, məzmununda insanların tərbiyə edilməsi, dərrakəli, xeyirxah, nəcib, məsuliyyətli, şərəfli olmaları dayanır. Bu işdə müəllimlər əvəzsiz rol oynayırlar. Ümummilli liderimiz Heydər Əliyev müəllim haqqında demişdir: "Məm Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Çıxışında bir müddət öncə akademik Şalva Amonaşvilinin iştirakı ilə keçirilən tədbiri xatırladan rektor vurğulayıb ki, həmin günlərdə ürəyimizdə bir sevinc hissi yaşayırdı. Biz həmin sevinc hissini bu gün yenidən yaşayırıq. Rektor çıxışının sonunda Beynəlxalq Humanist Pedaqogika Mərkəzinin rəhbərliyinə və tədbirin keçirilməsinə verdiyi dəstəyə görə Təhsil Nazirliyinin rəhbərliyinə təşəkkür edib, iştirakçılara uğurlar arzulayıb.

Plenar iclasda akademik Şalva Amonaşvili "Ailə.Uşaqlar.Həyat" mövzusunda çıxış edib. Çıxışında Azərbaycanda belə beynəlxalq bir tədbirin keçirilməsindən məmnunluq duyduğunu bildirib və buna görə Təhsil Nazirliyinin, ADPU-nun rəhbərliyinə minnətdarlıq edib. Beynəlxalq oxularda müxtəlif ölkələrdən çoxlu sayda gənc müəllimlər iştirak edirlər. Ailə yalnız sosial kateqoriya deyil, həm də təbiət kateqoriyasıdır. Müasir dünyamız sürətlə dəyişir, yenilәşir, inkişaf edir. Çox əfsuzlar olsun ki, hazırda cəmiyyətdə tənhalıq hissinin



güclənməsi müşahidə edilir. Bu, cəmiyyət üçün, bəşəriyyət üçün çox təhlükəlidir. İnsanın ailə mühiti, ailə hissləri olmadan yaşaması çətindir. Ailənin qorunub-saxlanılması olduqca vacibdir.

Çıxışını ayrı-ayrı nümunələr əsasında quran akademik Şalva Amonaşvili bildirib ki, şagirdlərin tərbiyəsi pedaqoji ustalıq, həssaslıq, yüksək mədəni səviyyə tələb



edir. Humanist pedaqogikaya görə, müəllim yalnız bilikləri öyrətməklə kifayətlənmir, o şagirdlərə varlığını, ürəyinin işığını verir, onlar üçün fədakarlıqla çalışmağı özünün ali məqsədi, başlıca hədəfi bilir.

Təhsil naziri vəzifələrini müvəqqəti icra edən Ceyhun Bayramov çıxışında Beynəlxalq Humanist Pedaqogika Mərkəzinin Azərbaycanda müxtəlif elmi-praktik konfranslar, seminarlar, ustad dərsləri və digər tədbirlər keçirdiyini bildirib. Beynəlxalq oxuların təhsil sahəsi üçün vacib olduğunu qeyd edən Ceyhun Bayramov ölkəmizdə ailənin, ailə tərbiyəsinin sabit, müqəddəs və vacib olduğunu vurğulayıb. Bu beynəlxalq tədbirin ADPU-da keçirilməsi universitetdə islahatların, yeniliklərin həyata keçirilməsinin mühüm göstəricilərindən biridir. Ceyhun Bayramov beynəlxalq oxuların səmərəli keçməsini arzulayıb və iştirakçılara uğurlar arzulayıb.

AMEA-nın vitse-prezidenti, akademik İsa Həbibbəyli çıxış edərək beynəlxalq oxuların çox aktual mövzuya həsr edildiyini və



bu mövzuya konseptual yanaşmanın vacib olduğunu bildirib. Qeyd edib ki, ailə ümumi mənəvi birlik, qarşılıqlı hörmət, qarşılıqlı anlaşma, rəğbət, təmənnasız xidmət əsasında formalaşmalıdır. Ailə dəyərləri müqəddəs tutulmalı, ailə institutu qorunub-saxlanılmalıdır.

Tallin şəhərinin vitse-meri Vadim Belobrovçev, kulturoloq, tarix elmləri doktoru, professor Fuad Məmmədov çıxış edərək humanist pedaqogikanın yüksək mədəni səviyyəli insanların formalaşmasına müsbət təsir göstərdiyini bildiriblər və beynəlxalq oxuların keçirilməsinin təqdirəlayiq olduğunu diqqətə çatdırıblar.

Fəlsəfə elmləri doktoru, Əməkdar elm xadimi, professor Rəfiqə Əzimova "Azərbaycan ailəsinin ənənələri" mövzusunda, kimya elmləri namizədi Klara Mansurova "Xalqların bütövləşməsində ailənin rolu və əhəmiyyəti" mövzusunda, Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin rəhbəri Riza Xəlilov "Ailə kainatın kosmik simvoniyasında əsas həyati dəyərdir" mövzusunda çıxışlar ediblər.

Sonra beynəlxalq oxular öz işini ustad dərslərində və laborator məşqlərdə davam etdirib. Ustad dərslərində və laborator məşqlərdə ailənin genetik kodu, ailə institutunun cəmiyyətdəki rolu, ailənin uşağın tərbiyəsində və inkişafında rolu, uşaqlarda ailə dəyərlərinin tərbiyə edilməsi, uşaqların tərbiyəsində mühitin əhəmiyyəti, qadınların ailədəki roluna baxış, ailə dialoqunda qarşılıqlı anlaşmanın rolu, ailədə yüksək mədəniyyət hissinin tərbiyəsi, müasir ailə və zamanın çağırışları, valideynliyin dərk edilməsi, valideynlərin təhsili, valideyn əməyinin qiymətləndirilməsi, ailənin mənəvi əsasları, ailə müdrikliyinin inkişafı ilə bağlı maraqlı təqdimatlar edilib, müzakirələr aparılıb.

Tədbirin ilk günündə İmanuel Kant adına Baltik Federal Universitetinin tələbələrinin ifasında "Fənərçi" tamaşası, E.İ.Mışkinin müəllifi və quruluşçu rejissoru olduğu "3-cü mərtəbə" tamaşası nümayiş etdirilib.

Beynəlxalq oxular martın 25-də yekunlaşacaq. Tədbirin sonunda mükafatlandırma mərasimi keçiriləcək, fəal iştirakçılara sertifikatlar təqdim ediləcək. Humanist Pedaqogika üzrə XVIII Beynəlxalq Oxuların mövzuları qəbul ediləcək, yeri və vaxtı müəyyənləşdiriləcək, Humanist Pedaqogikanın Himni səsləndiriləcək. Tədbir çərçivəsində iştirakçıların Azərbaycanın tarixi və mədəni yerləri ilə tanışlığı təşkil ediləcək.

Mənsur İbrahimli

# ADPU-nun Ağcabədi Filialında Novruz şənliyi

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Novruz şənliyi keçirilib.Tədbirdə filialın professor-müəllim heyəti, tələbələr iştirak edib.



Tədbiri filialın direktoru, dosent Mətanət Fərzəliyeva açaraq şənlik iştirakçılarını əziz bayram münasibətilə təbrik edib. Dosent M.Fərzəliyeva xalqımızın əziz, sevimli bayramı olan Novruzun qədim tarixə malik olduğunu qeyd edib. Xalqımızın bu bayramı həmişə sevinclə qarşıladığını, tarixin müxtəlif dönəmlərində, ağır şəraitdə belə qeyd etdiyini söyləyən dosent M.Fərzəliyeva müstəqillik əldə edildikdən sonra Novruz bayramının dövlət səviyyəsində keçirilməsinin təşəbbüskarının ulu öndər Heydər Əliyevin olmasını xüsusilə qeyd edib. Ümummilli lider Heydər Əliyevin Novruz bayramı haqqında söylədiyi aşağıdakı fikri şənlik iştirakçılarının diqqətinə çatdırıb: " Novruz bizim ən qədim milli bayramımızdır. O, xalq bayramıdır. Xalqımız çoxəsrlik tarixində böyük sınaqlardan keçib.Tariximizin ağır, çətin dövrləri olubdur. İnsanlar ağır günlər, çətin illər yaşayıblar. Ancaq bunlara baxmayaraq, Novruz bayramını heç kəs heç vaxt unutmayıb. Əksinə, Novruz bayramı insanları, xalqımızı həmişə sevindirib. Ən çətin anlarda, ən ağır günlərdə də onlarda xoş, nikbin əhvali-ruhiyyə yaradıbdır. Ona görə də bu bayram hər bir azərbaycanlı üçün əziz bayramdır".

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev Ulu Öndərin layiqli davamçısı kimi Novruzun yüksək səviyyədə qeyd olunmasına xüsusi diqqət yetirir. 2009-cu ildə Novruz bayramı UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilmişdir. 2010-cu ildə BMT tərəfindən 21 Mart "Beynəlxalq Novruz Günü" elan edilmişdir. Beləliklə, xalqımızın qədim bayramı olan Novruz dünyada qeyd olunur.

Tədbir tələbələrin hazırladıqları musiqili-əyləncəli proqramla davam edib.

# ADPU-nun Şamaxı Filialında Novruz bayramına həsr olunmuş şənlik

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Univeristetinin (ADPU) Şamaxı Filialında qədim milli bayramımız olan Novruz bayramına həsr olunmuş tədbir keçirilib. Tədbirdə filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələr, həmçinin Fövqəladə Hallar Nazirliyinin "N" hərbi hissəsinin zabit və əsgər heyəti iştirak ediblər.



Filialın həyətyanı sahəsində təşkil olunan tədbiri giriş sözü ilə filialın direktoru, dosent Tünzalə Yusifova açaraq bu gözəl bayram münasibətilə bütün tədbir iştirakçılarını təbrik edib, hər bir azərbaycanlı ailəsinə bol ruzi-bərəkət, ölkəmizə əmin-amanlıq arzulayıb. Dosent T.Yusifova tədbirdə iştirak edən əsgərlərin timsalında bütün Azərbaycan hərbçi və əsgərlərinin də bayramını təbrik edib və gələn il Novruz bayramını Qarabağda qeyd etmək arzusunu dilə gətirib.

Tədbir Novruzun əsas personajları olan Keçəl, Kosa, Bahar qızın gəlişi ilə daha da şənlənib. Bayram tonqalı ətrafında yallı gedən tələbələr rəqsləri, səhnəcikləri ilə tədbirə rəng qatıblar. Tədbirə dəvət olunmuş əsgərlərin də tələbələrlə birgə rəqsləri xüsusi sevinclə qarşılanıb.

Tədbirdə müxtəlif nominasiyalar - xonça dekorasiyası, süfrə bəzəyi, əl işləri (şəkərbura bəzəyi, yumurta boyama), ən yaxşı rəqs və səhnəcik üzrə müsabiqələr keçirilib. Tələbələr dekorasiyalarda daha çox milli rəmzlərə və adət-ənənələrə diqqət yetiriblər. Nominasiyalar üzrə birinci yerə layiq görülən tələbələr diplomla təltif olunublar.

Sonra tələbələr bayram sovqatları ilə "N" hərbi hissəsinin əsgərlərini, Şamaxı şəhər 1 saylı İxtisaslaşdırılmış ruhi-əsəb əlilləri üçün internat evinin sakinlərini sevindiriblər. İnternat evində tələbələrin açdığı bayram süfrəsi minnətdarlıqla qarşılanıb. Bundan əlavə, tələbələr Şamaxı rayonunda tənha yaşayan 10-a yaxın sakinin evində olublar, onlara qayğıkeş münasibət göstəriblər, problemləri ilə maraqlanıblar, bayram sovqatı ilə sevindiriblər. Görüşlər səmimi və kövrək anlarla yadda qalıb.

Bu bayram günlərində filialın kollektivi Şamaxı Rayon İcra Hakimiyyətinin Şamaxının qədim kəndlərindən biri olan Dəmirçi kəndində təşkil etdiyi Novruz şənliyində də iştirak edib.

# "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxuların bağlanış mərasimi

Xəbər verdiyimiz kimi, martın 23-25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Beynəlxalq Assosiasiya" İctimai Birliyinin Humanist Pedaqogika Beynəlxalq Mərkəzinin, ADPU-nun və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxular keçirilib. Qeyd edək ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərov "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxuların təşkili barədə müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən tədbirin yüksək səviyyədə keçirilməsi məqsədi ilə 22 nəfərdən ibarət Lokal Təşkilat Komitəsi yaradılıb. Beynəlxalq oxularda Rusiyanın, Ukraynanın, Belarusun, Estoniyanın, Latviyanın, Litvanın, Qazaxıstanın, Gürcüstanın və eləcə də respublikamızın humanist pedaqogika sahəsində çalışan tanınmış və nüfuzlu alim-mütəxəssisləri, gənc müəllimlər, psixoloqlar, sosioloqlar, həkim-metodistlər iştirak ediblər.



Plenar iclasdan sonra öz işini ustad dərslərində və laborator məşqlərdə davam etdirən beynəlxalq oxularda ailənin genetik kodu, ailə institutunun cəmiyyətdəki rolu, ailənin uşağın tərbiyəsində və inkişafında rolu, uşaqlarda ailə dəyərlərinin tərbiyə edilməsi, uşaqların tərbiyəsində mühitin əhəmiyyəti, qadınların ailədəki roluna baxış, ailə dialoqunda qarşılıqlı anlaşmanın rolu, ailədə yüksək mədəniyyət hissinin tərbiyəsi, müasir ailə və zamanın çağırışları, valideynlərin dərk edilməsi, valideynlərin təhsili, valideyn əməyinin qiymətləndirilməsi, ailənin mənəvi əsasları, ailə müdrikliyinin inkişafı ilə bağlı maraqlı təqdimatlar edilib.

Oxuların son günündə Ümumukrayna Humanist Pedaqogika Mərkəzinin prezidenti Stanislav Kruqun "Yüzilliklər boyu ailə müdrikliyinin inkişafı" mövzusunda, müəllim, psixoloq Marina Qalievanın "Qadının etirafı" mövzusunda təqdimatları dinlənilib. Böyük alimlərin, filosofların, şair və yazıçıların, ictimai və dövlət xadimlərinin ailə həyatlarından gətirilən nümunələr əsasında qurulan təqdimatlar iştirakçılar tərəfindən böyük maraqla qarşılanıb.

"Rusiya dərsliyi" korporasiyasının strateji kommunikasiya və inkişaf məsələləri üzrə vitse-prezidenti, "Bir sentyabr" nəşrlər evinin baş redaktoru Artyom Soloveyçik öz şəxsi ailə nümunəsindən çıxış edərək gözəl, xoşbəxt ailə, qadının ailədə, cəmiyyətdə missiyası ilə bağlı fikirlərini tədbir iştirakçılarının diqqətinə çatdırıb.



Sonra təqdimatlarla bağlı fikirlər, təkliflər, təəssüratlar bölüşülüb, səmərəli müzakirələr aparılıb.

Martın 25-də "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxuların yekun mərasimi keçirilib. Yekun mərasimində mükafatlar , hədiyyələr və fəal iştirakçılara sertifikatlar təqdim edilib. ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Bakı Humanitar Kollecinin direktor müavini Afaq Əliyeva, Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin rəhbəri Riza Xəlilov beynəlxalq oxuların təşkilində fəal iştirak etdiklərinə görə mükafatlandırılıblar.

Rektor Cəfər Cəfərov çıxış edərək bildirib ki, müasir dünyamızda humanist pedaqogikanın tərəfdarlarının sayının sürətlə artması sevindirici haldır. Beynəlxalq oxuların keçirildiyi günləri mənəviyyat, sevinc, müdriklik bayramı kimi qiymətləndirən rektor tədbirin ADPU-da keçirilməsinə görə universitetin çoxminlik kollektivi adından Beynəlxalq Humanist Pedaqogika Mərkəzinin rəhbərliyinə təşəkkür edib və onlara uğurlar arzulayıb.

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov çıxışında qeyd edib ki, son illər ölkəmizdə müxtəlif nüfuzlu və mötəbər tədbirlər yüksək səviyyədə keçirilir. Beynəlxalq oxular bu tədbirlər arasında xüsusi yer tutur. Çünki humanist pedaqogikanın məqsədi cəmiyyətin qarşısında duran vəzifələri həll etməyə qadir olan vətəndaş yetişdirməkdir.



Təhsil eksperti, Əməkdar müəllim Asif Cahangirov beynəlxalq oxuların keçirildiyi günlərin həyatımızda xüsusi əhəmiyyət kəsb etdiyini vurğulayıb və təhsilin humanistləşdirilməsinə xidmət edən bu tədbirin keçirilməsinə görə akademik Şalva Amonaşviliyə və ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Yekun mərasimində Beynəlxalq Humanist Pedaqogika Mərkəzinin fəxri prezidenti, akademik Şalva Amonaşvili və prezidenti Paata Amonaşvili çıxış edərək qonaqpərvərliyə, səmimi və isti münasibətə, eləcə də tədbirin yüksək səviyyədə təşkilinə görə ADPU-nun rəhbərliyinə və bu işdə əməyi keçən hər kəsə təşəkkür ediblər.

Mərasimdə Humanist Pedaqogika üzrə XVIII Beynəlxalq Oxuların mövzuları qəbul olunub, yeri və vaxtı müəyyənləşdirilib, Humanist Pedaqogikanın Himni səsləndirilib.

Mərasimdə Bakı Humanitar Kollecinin müəllim və tələbələrinin, həmçinin Bakı şəhəri, Sabunçu rayonu, 75 nömrəli tam orta məktəbin şagirdlərinin ifasında maraqlı və rəngarəng konsert proqramı təqdim edilib.

Sonda xatirə şəkli çəkdirilib. Akademik Şalva Amonaşviliyə universitetin hədiyyəsi təqdim edilib. Tədbir çərçivəsində iştirakçıların Azərbaycanın tarixi və mədəni yerləri ilə tanışlığı təşkil edilib. Onu da qeyd edək ki, beynəlxalq oxular ölkəmizin elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirilib, media tərəfindən geniş işıqlandırılıb.

**Mənsur Qüdrətoğlu**

# "Təhsildə tədqiqat" mövzusunda məruzə

Martın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ADPU-nun və Amerika Birləşmiş Ştatlarının (ABŞ) ölkəmizdəki səfirliyinin birgə təşkilatçılığı ilə ABŞ-ın Kolumbiya Universitetinin professoru xanım Amra Sabic-El-Rayessin "Təhsildə tədqiqat" mövzusunda məruzəsi dinlənilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, struktur bölmələrin müdirləri, müəllimlər iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov bildirib ki, universitetdə ardıcıl olaraq təhsil sahəsi ilə bağlı müxtəlif tədbirlər keçirilir. Bu tədbirlərin keçirilməsi təhsilin keyfiyyətinin yüksəldilməsinə, professor-müəllim heyətinin fəallığının artırılmasına xidmət edir. Bu gün "Təhsildə tədqiqat" mövzusunda məruzəsini dinləyəcəyimiz ABŞ-ın Kolumbiya Universitetinin professoru xanım Amra Sabic-El-Rayess təhsil sahəsində tanınmış və nüfuzlu mütəxəssisdir. Professor Amra Sabic-El-Rayess Bosniya və Herseqovinada doğulub. Təhsil sahəsində aktual mövzularda müxtəlif dəyərli tədqiqatlar aparıb. Onun tədqiqatları sosial mobilliyi, inkişafı, təhsil liderliyini və təhsil təşkilatçılığını, keyfiyyətli müəllim hazırlığını, radikalizmi, korrupsiyanı, qadınların cəmiyyətin inkişaf prosesindən kənarda qalmamalarını və digər vacib məqamları əhatə edir. Gənc və perspektivli alim Amra Sabic-El-Rayess təhsil sahəsində bir sıra məsələləri yüksək səviyyədə tədris və tədqiq edib, əsərlər dərc etdirib. Beynəlxalq təşkilatlarla sıx əməkdaşlıq edir.





Professor Amra Sabic-El-Rayess çıxışında öncə məruzənin dinlənilməsinin təşkilinə görə ABŞ Dövlət Departamentinə, ABŞ-ın Azərbaycandakı səfirliyinə və ADPU-nun rəhbərliyinə təşəkkür edib. Azərbaycanda ilk dəfə olduğunu vurğulayan xanım Amra Sabic-El-Rayess ölkəmizin gözəlliyindən, xalqımızın qonaqpərvərliyindən, mehribanlığından, səmimiyyətindən məmnunluq duyduğunu bildirib.

Təhsil sahəsində apardığı tədqiqatlar barədə məlumat verən professor Amra Sabic-El-Rayess müxtəlif genişmiqyaslı layihələr həyata keçirdiyini, bir çox ölkələrdə aztəminatlı ailələrin övladlarının və qadınların təhsilə cəlb edilmələri üçün məqsədyönlü fəaliyyət göstərdiyini, həmçinin radikalizmə qarşı mübarizə apardığını qeyd edib. Bildirib ki, təhsil hər bir ölkənin, xalqın inkişafının əsas amili, uğurlu gələcəyinin həlledici təminatçısıdır. Təhsildə bilik, bacarıq, səriştə əsas meyar kimi götürülməlidir. Təhsil daim dəyişən, yenilənən, inkişaf edən bir sistemdir. Təhsil sosial mobilliyə keçiddə mühüm rol oynayır, bu işdə ən gözəl və ən uğurlu mexanizmdir. Buna görə də öz tədqiqatlarında təhsil sahəsində mövcud vəziyyətin dəyişməsinə çalışıb. Təhsildə yeni yanaşmaların, paradiqmaların tətbiq edilməsi üçün əzmlə fəaliyyət göstərib.

Çıxışında ayrı-ayrı ölkələrin təhsil sahəsindən konkret rəqəmlər, statistik göstəricilər əsasında nümunələr gətirən professor Amra Sabic-El-Rayess qeyd edib ki, ABŞ-da irqi, etnik və dini mənsubiyyətindən, sosial mənşəyindən asılı olmayaraq biliyi, bacarığı və səriştəsi ilə fərqlənən aztəminatlı ailələrin övladları universitetlərə qəbul edilirlər. Onların təhsili, karyera inkişafı diqqət mərkəzində saxlanılır. İnkişaf etmiş ölkələrin ali təhsil müəssisələri öz fəaliyyətlərini və rəqabətqabiliyyətli mütəxəssis hazırlığını qlobal dünyada baş verən böyük dəyişikliklərə uyğun olaraq qururlar.

Rektor Cəfər Cəfərov çıxışında qeyd edib ki, "Təhsildə tədqiqat" mövzusunda məruzə, əslində, böyük inkişaf prosesinin tərkib hissəsidir. ABŞ-da bilikli, istedadlı, bacarıqlı insanların ölkənin inkişafına xidmət etmələri üçün xüsusi mexanizmlər mövcuddur. Rəqabət mühitinin yaranması inkişafa xidmət edir. ABŞ-ın inkişafının kökündə məhz bu amil dayanır. Rektor çıxışının sonunda professor Amra Sabic-El-Rayessə maraqlı məruzəyə görə təşəkkür edib və uğurlar arzulayıb.

Tədbirdə çıxış edən Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə, professor Buludxan Xəlilov, dosent Şahin Pənahov, dosent Yusif Alıyev və başqaları ali təhsil müəssisələrinin şəffaf və obyektiv fəaliyyəti, gələcəkdə müxtəlif ölkələrdə təhsil sahəsində proqnozlaşdırılan inkişaf meyilləri, müəllimlərin keyfiyyətli tədris etmək bacarıqları ilə bağlı fikirlərini bölüşüblər.

**Orxan Abdullayev**

# ADPU-nun Şəki Filialında 31 Mart soyqırımının 100 illiyinə həsr olunmuş elmi konfrans

Martın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında 31 Mart 1918-ci il-azərbaycanlıların soyqırımının 100 illiyinə həsr olunmuş elmi konfrans keçirilib. Konfransda Bakı Dövlət Universitetinin (BDU) kafedra müdiri, tarix elmləri doktoru, professor Anar İsgəndərov, filialın direktoru, dosent Rafiq Rasulov, professor-müəllim heyəti və tələbələri iştirak ediblər.



Filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov konfransı giriş sözü ilə açaraq, ermənilər tərəfindən Azərbaycan türklərinə qarşı həyata keçirilmiş soyqırımı aktının 100 illiyi münasibətilə filialda bir sıra tədbirlərin keçirilməsinin planlaşdırıldığını və bugünkü konfransın da belə tədbirlərdən biri olduğunu vurğulayıb.

Sonra konfransda XX əsrin əvvəllərində Azərbaycanın türk-müsəlman əhalisinə qarşı törədilmiş soyqırımlarının tarixinin görkəmli tədqiqatçısı, BDU-nun Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrasının müdiri, tarix elmləri doktoru, professor A.İsgəndərovun "31 Mart -Azərbaycan türklərinin soyqırımı" mövzusunda məruzəsi, filialın Humanitar fənlər kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru, baş müəllim Vüsal Baxışovun "XX əsrdə türklərə qarşı həyata keçirilmiş soyqırımlarının coğrafiyası, məqsəd və nəticələri", həmin kafedranın əməkdaşları: baş müəllim Həbibulla Manaflının "Sovet bolşevizminin Azərbaycanda ermənilərlə birgə törətdiyi rəzalətlər", baş müəllim Tahir Məhərrəmovun "31 Mart Azərbaycan türklərinin soyqırımı erməni vəhşiliyinin ən bariz təzahürüdür" mövzularında çıxışları dinlənilib, məruzə və çıxışlar ətrafında müzakirələr aparılıb.

Elmi konfransın sonunda 31 Mart soyqırımına həsr edilmiş film nümayiş etdirilib.

# Elmi Şuranın iclası

Martın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə ADPU-nun nəzdində fəaliyyət göstərən FD.02.061 Dissertasiya Şurasının fəaliyyəti haqqında, ADPU-da 2017-ci il üçün mədəni-kütləvi tədbirlərin təşkili barədə, ADPU-nun İbtidai təhsil fakültəsinin fəaliyyəti haqqında və cari məsələlər daxildir.

ADPU-nun nəzdində fəaliyyət göstərən FD.02.061 Dissertasiya Şurasının fəaliyyəti haqqında Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov məlumat verib. Professor Asəf Zamanov bildirib ki, ADPU-nun nəzdində fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsini keçirən FD.02.061 Dissertasiya Şurası Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 3 mart 2017-ci il tarixli 38 nömrəli əmri ilə təsdiq edilib. Dissertasiya Şurasına müdafiə üçün "Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi" - pedaqogika elmləri, "Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (riyaziyyatın tədrisi metodikası, tarixin tədrisi metodikası, Azərbaycan dilinin tədrisi metodikası, biologiyanın tədrisi metodikası)" - pedaqogika elmləri, "Korreksiya pedaqogikası"-pedaqogika elmləri ixtisasları üzrə dissertasiyaların qəbul edilməsinə icazə verilib. 3 mart 2017-ci il tarixə kimi FD.02.061 Dissertasiya Şurasına elmlər doktoru proqramı üzrə "Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi" ixtisasından 4 nəfər, fəlsəfə doktoru proqramı üzrə 37 nəfər sənədlərini təqdim edib. 3 mart 2017-ci il tarixdən 28 mart 2018-ci il tarixə kimi Dissertasiya Şurasına elmlər doktoru proqramı üzrə 8 nəfər sənədlərini təqdim edib. Fəlsəfə doktoru proqramı üzrə 24 nəfər sənədlərini təqdim edib. 3 mart 2017-ci ildən 28 mart 2018-ci ilə kimi Dissertasiya Şurasında 18, o cümlədən 13 fəlsəfə doktorluğu və 5 elmlər doktorluğu dissertasiyası müdafiə edilib. Hazırda Dissertasiya Şurasında elmlər doktoru proqramı üzrə 8 nəfər; fəlsəfə doktoru proqramı üzrə 48 nəfər növbədədir. Dissertasiya Şurası fəaliyyətini Ali Attestasiya Komissiyasının Əsasnaməsinə uyğun davam etdirir.

Elmi Şura professor A.Zamanovun hesabatını qəbul edib.



ADPU-da 2017-ci il üçün mədəni-kütləvi tədbirlərin təşkili barədə Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev məlumat verərək bildirib ki, mədəni-kütləvi tədbirlərin keçirilməsində başlıca məqsəd tələbələrimizdən müxtəlif ixtisaslar üzrə yüksək səviyyəli pedaqoji kadrlar hazırlamaqla yanaşı, sağlam düşüncəli, milli ruhlu, Vətənini sevən vətəndaş formalaşdırmaqdır. Universitetdə təşkil olunan mədəni-kütləvi tədbirlərdən danışarkən, ilk növbədə, xalqımızın ümummilli lideri Heydər Əliyevin doğum günlərinə və anım mərasimlərinə həsr olunmuş tədbirləri qeyd etmək lazımdır. Bununla yanaşı, 20 Yanvar faciəsinin ildönümü, 26 Fevral -Xocalı soyqırımı, 31 Mart - Azərbaycanlıların Soyqırımı Günü, 28 May - Respublika Günü, 15 Sentyabr - Bilik Günü, 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni İl bayramı, Novruz bayramı, 5 Oktyabr - Beynəlxalq Müəllimlər Günü münasibətilə keçirilən tədbirləri qeyd etmək məqsədəuyğundur. Dövlət əhəmiyyətli tədbirlər Azərbaycan Respublikasının Prezidenti Administrasiyasının, Təhsil Nazirliyinin, Gənclər və İdman Nazirliyinin sərəncam və əmrləri əsasında həyata keçirilir. Anım mərasimlərində universitetin professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanı, Xocalı abidəsini ziyarət edir, tədris binalarında xüsusi tədbirlər təşkil olunur. Dövlət əhəmiyyətli tədbirlərdə tələbələrimizin IV İslam Həmrəyliyi Oyunlarında, Formula-1 yarışlarında və digər bu növ tədbirlərdə könüllü iştiraklarını qeyd etmək vacibdir. Bu tədbirlərdə tələbə-gənclərimiz ADPU-nu yüksək səviyyədə təmsil ediblər. Bir sıra mədəni-kütləvi tədbirlər Təhsil Nazirliyinin əmrləri və məktubları əsasında həyata keçirilir. Buna nümunə olaraq Bir Könüllü-Bir tələbə proqramını, Debat həftəsini, müxtəlif maarifləndirici tədbirləri, yarışları, müsabiqələri və digər tədbirləri göstərmək olar. Tədbirlər digər qurumlarla da əməkdaşlıq çərçivəsində təşkil olunur. Bu qurumlardan Yeni Azərbaycan Partiyasını, Səbail Rayon İcra Hakimiyyətini, Azərbaycan Respublikası Tələbə Gənclər Təşkilatları İttifaqını, Azərbaycan Qızıl Aypara Cəmiyyətini xüsusi qeyd etmək olar.

Mədəni-kütləvi tədbirlər sırasında ADPU-nun tələbələrinin xalqımızın görkəmli şəxsiyyətləri - şair və yazıçılar, alimlər, tanınmış mədəniyyət və incəsənət xadimləri və s. görüşlərin keçirilməsinə, eləcə də kitab təqdimatlarına xüsusi diqqət yetirilir. Universitetdə əyləncəli tədbirlər də həyata keçirilir. Bunlardan Novruz bayramı, Məzun Günü, konsertlər, teatr tamaşaları, "Şən və Hazırcavablar Klubu"nun təşkil etdiyi yarışlar və tamaşalar böyük marağa səbəb olur. Mədəni-kütləvi tədbirlərin təşkilində Tələbə Gənclər Təşkilatı (TGT), Tələbə Həmkarlar Komitəsi (THK), İdman Klubu, fakültələr yaxından iştirak edirlər.



ADPU-nun fəal qurumlarından biri TGT-dir. TGT-nin son illər həyata keçirdiyi tədbirlər, əldə etdiyi uğurlar diqqəti cəlb edir və müxtəlif qurumlar tərəfindən yüksək qiymətləndirilir. Keçirilən mədəni-kütləvi tədbirlər İctimaiyyətlə əlaqələr və marketinq şöbəsi tərəfindən çap və elektron mediasında, sosial şəbəkələrdə geniş işıqlandırılır. Eyni zamanda müəllim və tələbələrimizin mətbuatda çıxış etmələrinə, onların uğurlarının təbliğ edilməsinə dəstək verilir.

Tələbələrimiz üçün mühüm əhəmiyyət kəsb edən yataqxana məsələsinin həlli istiqamətində də tərəfimizdən əməli tədbirlər həyata keçirilir. Hazırda 207 yerlik tələbə yataqxanamız və 27 yerlik qonaq otağı olan yataqxanamız fəaliyyət göstərir. Aztəminatlı ailələrdən olan tələbələrin və dövlət proqramı əsasında təhsil alan xarici tələbələrin yataqxanada yerləşmələrinə üstünlük verilir.

Ötən il ADPU-nun uğurlarından biri kimi universitetimizin Təhsil Nazirliyi tərəfindən EXPO Mərkəzində təşkil edilən 11-ci Azərbaycan Beynəlxalq "Təhsil və karyera" Sərgisində iştirakını xüsusi qeyd etmək olar. Qısa müddətdə rəhbərliyin dəstəyi ilə ADPU-nun loqosundan, müxtəlif materiallardan, videoçarxlardan, dərsliklərdən, elmi monoqrafiyalardan, tələbələrin rəsm əsərlərindən, əl işlərindən ibarət ADPU-nun tarixini və müasir fəaliyyətini əks etdirən stend hazırlandı. ADPU-nun stendi sərgi iştirakçılarının diqqətini cəlb edirdi. Prorektor F.Rzayev çıxışının sonunda mədəni-kütləvi tədbirlərin daha səmərəli və maraqlı keçirilməsi üçün təkliflərlə çıxış edib.

Elmi Şura professor F.Rzayevin hesabatını qəbul edib.

İbtidai təhsil fakültəsinin fəaliyyəti haqqında fakültənin dekanı, professor Fərrux Rüstəmov çıxış edib. Qeyd edib ki, İbtidai təhsil fakültəsi 1958-1959-cu tədris ilində yaranıb. Fakültənin yaranmasında akademik Mehdi Mehdizadənin, professor Mərdan Muradxanovun və dosent Əfşan Qədimbəyovanın mühüm xidmətləri olub. Fakültənin məzunlarının sayı 20 mindən çoxdur. İbtidai təhsil fakültəsində İbtidai təhsilin pedaqogikası və metodikası kafedrası, Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası kafedrası və Pedaqoji təhsilin problemləri elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir. Fakültədə 1389 nəfər tələbənin təhsil-tərbiyəsi ilə 10 nəfər elmlər doktoru, professor, 50 nəfər fəlsəfə doktoru, dosent, 15 nəfər baş müəllim, 20 nəfər müəllim məşğul olur. Fakültə əməkdaşları son 3 ildə 9 dərslik, 56 dərs vəsaiti, 102 proqram, respublikada 253 məqalə, xaricdə 81 məqalə nəşr etdiriblər. Fakültə əməkdaşları respublika səviyyəli 117, beynəlxalq səviyyəli 44 konfransda iştirak ediblər. Son 3 ildə fakültənin əməkdaşları respublikada 52, xarici ölkədə 20, institutda 21 treninqdə iştirak ediblər. Fakültədə tələbələrin sosiallaşması üçün sistemli iş aparılır, muzeylərə, tarixi yerlərə ekskursiyalar təşkil olunur. Əvvəlki illərlə müqayisədə tədrisin keyfiyyəti xeyli yüksəlib. Əyani şöbədə 2016-2017-ci tədris ilinin payız semestrinin imtahan sessiyasında müvəffəqiyyət 81%, keyfiyyət 5% olduğu halda, 2016-2017-cı tədris ilinin yaz semestrinin imtahan sessiyasında müvəffəqiyyət 95%, keyfiyyət 17% artıb. Qiyabi şöbədə 2016-2017-ci tədris ilinin payız semestrinin imtahan sessiyasında müvəffəqiyyət 78%, keyfiyyət 0% olduğu halda, 2016-2017-cı tədris ilinin yaz semestrinin imtahan sessiyasında müvəffəqiyyət 91%, keyfiyyət 20% artıb. Əyani şöbə üzrə dövlət imtahanının nəticələrinə görə müvəffəqiyyət 98%, keyfiyyət 19% olub. Qiyabi şöbə üzrə dövlət imtahanının nəticələrinə görə müvəffəqiyyət 100%, keyfiyyət 24% olub. Halbuki əvvəlki illərdə keyfiyyət 0% olub. 2017-2018-ci tədris ilində fakültəyə qəbul olunan 293 nəfər tələbədən 29-u 500-dən yuxarı bal toplayıb. Professor F.Rüstəmov bunun əsas səbəblərini Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müllimi təqaüdü"nün təsis olunması, müəllimlərin yerləşdirilməsində və yerdəyişməsində şəffaflığın və obyektivliyin təmin edilməsi, ibtidai sinif müəllimi hazırlığında pərakəndəliyə son qoyulması, ibtidai sinif müəllimliyi hazırlığının yalnız universitetə həvalə edilməsi, ADPU-da görülən işlər, sağlam, şəffaf və obyektiv təhsil mühitinin yaradılması, "Açıq qapı günü"nün keçirilməsi, Bakı məktəblərində yuxarı sinif şagirdləri ilə görüşlərin keçirilməsi, müəllim peşəsi ilə bağlı söhbətlərin aparılması, qabaqcıl məktəb direktorları və ustad müəllimlərlə görüşlərin keçirilməsi, ümumtəhsil məktəb müəllimlərinin fakültədə ustad dərslərinin təşkili, I tədris ilinə qəbul olunmuş tələbələrin və onların valideynləri ilə rektorun görüşlərinin keçirilməsi, universitetdə rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərdə tutan layihənin həyata keçirilməsi, ibtidai sinif müəllimlərinə olan tələbatın artması və digər amillərlə əlaqələndirib. Professor F.Rüstəmov çıxışının sonunda fakültənin inkişaf perspektivləri barədə də məlumat verib.

Elmi Şura professor F.Rüstəmovun hesabatını qəbul edib.

İbtidai təhsil fakültəsində aparılan monitorinqin nəticələri barədə Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib. Rəşad Sadıqovun məlumatında fakültədə mövcud olan çatışmazlıqlarla bağlı məqamlar öz əksini tapıb və bu çatızmazlıqların aradan qaldırılması tövsiyə edilib.

Sonra Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov cari məsələlər barədə məlumat verib. Cari məsələlər müzakirə edilib və müvafiq qərarlar qəbul olunub.

Sonda rektor Cəfər Cəfərov iclasda qarşıya qoyulan vəzifələrin həyata keçirilməsində Elmi Şura üzvlərinə uğurlar arzulayıb.

**Mahirə Mustafayeva**

# ADPU-nun əməkdaşları PETRA layihəsi çərçivəsində Vyana şəhərində keçirilmiş növbəti görüşdə iştirak ediblər

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) də tərəfdaş olduğu "Azərbaycan universitetlərində tədris və təlimin təkmilləşdirilməsi" (Promoting Excellence in Teasching and Learning in Azerbaijani Universities - PETRA) layihəsi çərçivəsində nəzərdə tutulmuş görüşlər davam edir. Erasmus+ Proqramı üzrə İspaniyanın Valensiya Politexnik Universitetinin koordinatorluğu ilə həyata keçirilən bu layihə çərçivəsində növbəti görüş 5-9 mart 2018-ci il tarixlərində Avstriyanın Vyana şəhərində yerləşən Vyana Tətbiqi Elmlər Universitetində (University of Applied Sciences bfi Vienna) keçirilib.

ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqovun və Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Günay Məhərrəmovanın da iştirak etdiyi təlimlərdə layihənin yerli və avropalı tərəfdaş ali məktəblərin nümayəndələri iştirak ediblər. Qeyd edək ki, Azərbaycan üzrə Azərbaycan Respublikası Təhsil Nazirliyi, Azərbaycan Dövlət Pedaqoji Universiteti, Xəzər Universiteti, Naxçıvan Dövlət Universiteti, Azərbaycan Dillər Universiteti, Sumqayıt Dövlət Universiteti, Gəncə Dövlət Universiteti, Bakı Slavyan Universiteti, Azərbaycan Universiteti, Avropadan isə Valensiya Universiteti-İspaniya, Qazi Universiteti (Türkiyə), Vyana Tətbiqi Elmlər Universiteti (Avstriya), Debreçen Universiteti (Macarıstan), Jivaskala Universiteti (Finlandiya) layihənin tərəfdaşlarıdır.



5 gün davam edən təlimin ilk günündə açılış və salamlama nitqindən sonra Azərbaycnda tədqiqat və inkişafın vəziyyəti, ali məktəblərdə bu sahədə əldə olunmuş nailiyyətlər, imkanlar və yeni çağırışlar haqqında təqdimat nümayiş etdirilib, müzakirələr aparılıb, müxtəlif fikirlər səsləndirilib. Sonra avstriyalı təmsilçi Dietmar Paier tərəfindən Avstriyada tədqiqat və inkişaf sistemi və tədrislə tədqiqatın əlaqəsi haqqında təqdimat nümayiş etdirilib.

Daha sonra həmin universitetin müxtəlif struktur bölmə rəhbərləri tərəfindən layihənin idarə olunması, Avstriyada tədqiqatın maliyyələşdirilməsi, Azərbaycan ali məktəblərinin beynəlxalq layihələrə qoşulma imkanları, tədris və tədqiqatın keyfiyyətinin idarə olunması haqqında təqdimatlar olub və müzakirələr keçirilib. Bununla yanaşı, təlim prosesində ispaniyalı kooordinatorun rəhbərliyi ilə sözügedən layihənin icrası ilə bağlı universitetlərin nümayəndələrinin iştirak etdikləri iclaslar da keçirilib.

Təlimin son iki günü ərzində isə bütövlükdə Azərbaycanda, eyni zamanda ayrı-ayrı universitetlərdə tədqiqatın vəziyyəti, bu sahədə bacarıqların artırılması üçün tələb olunan ehtiyacların müəyyənləşdirilməsi ilə bağlı qrup işi həyata keçirilib, universitetlər müəyyən təqdimatlarla çıxış ediblər. Görüş çərçivəsində avstriyalı nümayəndə tədbir iştirakçılarını Vyana şəhərinin bəzi tarixi və mədəni abidələri, "Xalq parkı" və Avropanın qədim ali məktəblərindən biri olan və 1365-ci ildə yaradılmış Vyana Universiteti ilə tanış edib.

Əsas məqsədi Azərbaycanın ali təhsil müəssisələrində tədris və təlimin təkmilləşdirilməsi sahəsində beynəlxalq əməkdaşlıq və qarşılıqlı təcrübə mübadiləsinin aparılmasından ibarət olan PETRA layihəsi çərçivəsində Vyana Tətbiqi Elmlər Universitetində keçirilmiş növbəti görüşün sonunda bütün iştirakçılara, o cümlədən, ADPU-nun nümayəndələrinə müvafiq sertifikatlar təqdim edilib.

# "31 Mart Soyqırımı - 100 il: Keçmişinə sahib dur, gələcəyini qur!" interaktiv dərsi

**Martın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "31 Mart Soyqırımı-100 il: Keçmişinə sahib dur, gələcəyini qur!" interaktiv dərsi keçirilib. Tədbirdə öncə 31 Mart soyqırımı zamanı həlak olmuş soydaşlarımızın və eləcə də bütün şəhidlərimizin xatirələri bir dəqiqəlik sükutla yad edilib.**

Tədbiri giriş sözü Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev açaraq bildirib ki, Azərbaycan xalqının tarixində faciəli günlər çoxdur. Bu faciəli günlər arasında 1918-ci ilin 31 Mart soyqırımı xüsusi amansızlığı və qəddarlığı ilə seçilir. 31 Mart soyqırımı ermənilərin öz havadarlarının köməyi ilə "Böyük Ermənistan" yaratmaq məqsədilə xalqımızın başına gətirdikləri ən böyük faciələrdən biridir. Bu soyqırımı zamanı 50 min azərbaycanlı qətlə yetirilib. Lakin hec bir faciə xalqımızın milli özünüdərki və müstəqil dövlət qurmaq əzmini qıra bilməyib. Mart soyqırımı Azərbaycanda milli hakimiyyət qurulmasının vacibliyini ortaya qoydu. 1918-ci ilin may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyəti yaradıldı. Azərbaycan Xalq Cümhuriyyətinin hökuməti ermənilərin törətdikləri ağır cinayətlərin araşdırılması üçün Fövqəladə İstintaq Komissiyası yaratmış, komissiyanın üzə çıxardığı həqiqətlərin xalqın yaddaşında hifz edilməsi və dünya ictimaiyyətinə çatdırılması üçün bir sıra tədbirlər görmüşdür. Lakin Xalq Cümhuriyyətinin süqutundan sonra bu proses dayandırılmış, baş verənlərin sona qədər təhqiq edilməsinin və ona müvafiq siyasi-hüquqi qiymət verilməsinin qarşısı alınmışdır. Yalnız 1998-ci il martın 26-da xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyevin imzaladığı "Azərbaycanlıların soyqırımı haqqında" Fərmanda həmin dəhşətli hadisələrə adekvat siyasi qiymət verilmiş və 31 mart "Azərbaycanlıların Soyqırımı Günü" elan edilmişdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev yanvarın 18-də "1918-ci il azərbaycanlıların soyqırımının 100 illiyi haqqında" Sərəncam imzalayıb. Sərəncamda erməni-bolşevik silahlı dəstələrinin 100 il əvvəl azərbaycanlılara qarşı törətdikləri bəşəri cinayətlər barədə həqiqətlərin ölkə və dünya ictimaiyyətinə daha dolğun çatdırılması məqsədilə qarşıda duran vəzifələr müəyyən edilib.




Tədbirdə Əhməd Cavadın "Susmaram" şeiri səsləndirilib. Tarix və coğrafiya fakültəsinin tələbələrinin ifasında "Soyqırımı" hekayəsi dinlənilib, intellekt-xəritə, oxşarlıqlar ücbucağı, klaster, "T" modeli, statistika mövzularında təqdimatlar edilib. Təqdimatlarda zaman və məkan daxilində mart soyqırımının başvermə səbəbləri və nəticələri ətraflı təhlil edilib. Qeyd edilib ki, mart qırğınları xalğımıza çox ağır itkilər verdi. Minlərlə insan günahsız olaraq öldürüldü, didərgün düşdü, əvəzi heç nə ilə ödənilə bilməyəcək maddi və mənəvi ziyan çəkdik. Faciəli mart hadisələrinin statistikası da bunu birmənalı şəkildə təsdiqləyir. Belə ki, 1918-ci ilin mart-aprel aylarında ermənilər Bakıda, Şamaxıda, Qubada, Muğanda və Lənkəranda 50 min azərbaycanlını qətlə yetirib, evləri qarət edib, on minlərlə şəxsi evlərindən qovublar.Təkcə Bakıda 30 min nəfər xüsusi qəddarlıqla qətlə yetirilib.Şamaxıda 58 kənd dağıdılıb, 7 min nəfər öldürülüb. Onlardan 1653-ü qadın, 965-i uşaq olub. Martın 31-də erməni daşnakları Şamaxı qəzasının 53 kəndində 8027-i azərbaycanlını, o cümlədən 2560 qadın və 1277 uşağı qətlə yetiriblər. Təkcə martın 31-də 8 minə yaxın azərbaycanlı öldürülüb, ümumilikdə martın 30-31-i və aprelin 1-də Bakıda 12 min nəfər qətlə yetirilib. Erməni dəstələri bir çox tikililərə-"İsmailiyyə" binasına, Təzəpir məscidinə od vurublar. Qubanın 162 kəndində öldürülən günahsız azərbaycanlıların sayı 16 mindən çox olub. Erməni daşnakları Lənkəran, Muğan və Dağlıq Qarabağda minlərlə kəndi yandırıb, on minlərlə insanı vəhşicəsinə qətlə yetiriblər.

Kütləvi qırğınlar Qarabağın azərbaycanlı kəndlərində, Şuşada, eləcə də aprel-may aylarında Şamaxıda, Qubada, Lənkəranda, Gəncəbasarda və başqa bölgələrdə davam edib, 30 mindən çox müsəlman-türk, habelə digər millətlərdən olanlar-ləzgilər, talışlar, yəhudilər, almanlar qətlə yetirilibər. Qubada 122, Qarabağda 150, Zəngəzurda 115 kənd yerlə-yeksan edilib, cinsindən və yaşından asılı olmayaraq, əhaliyə divan tutulub. İrəvan quberniyasında 211, Qarsda isə 92 azərbaycanlı kəndi dağılıb. İrəvan azərbaycanlılarının çoxsaylı müraciətlərindən birində göstərilib ki, qısa bir zamanda bu azərbaycanlı şəhərində və onun ətrafında 88 kənd dağıdılıb, 1920 ev yandırılıb, 131970 nəfər öldürülüb. Ermənilər əldə olunmuş sazişə əməl etməyərək Azərbaycan torpaqlarında terror və zorakılıqlara başlayıblar. 1917-ci ilin sonu-1918-ci ilin martınadək ermənilər tərəfindən İrəvan quberniyasında 197 kənd talan edilib. Zəngəzur qəzasında 109, Qarabağda 157 kənd qismən dağıdılıb. Ümumilikdə, Azərbaycanda 60 yaşayış məskəni tamamilə məhv edilib, 388-i qismən zərər çəkib, 5140 təsərrüfat viran qoyulub. Müsəlmanları qətlə yetirməklə yanaşı, ermənilər onların əmlaklarını da məhv edib, qiymətli əşyalarını özləri ilə aparıblar. Sonralar təkcə bir yerdən torpağın altından 57 müsəlman qadın və qızın meyiti tapılıb. Onların qulaqlarını, burunlarını kəsib, qarınlarını yırtıblar. Hamazaspın cəza dəstəsi Quba şəhərinin və Quba qəzasının 122 kəndini darmadağın edib. Qubada 2 mindən çox adamı-kişi, qadın və uşağı qətlə yetirib və həmin kəndlərin əhalisinə ümumi dəyəri 58121059 manatlıq (rubl) ziyan vurulub. 1918-ci ildən erməni silahlı qüvvələri tərəfindən Bakı Quberniyasında 229 yaşayış məntəqəsi, o cümlədən Şamaxı qəzasında 58, Quba qəzasında 122, Gəncə quberniyasında 272 yaşayış məntəqəsi (Zəngəzurda 115, Qarabağda 157), İrəvan quberniyasında 211(İrəvan qəzasında 32, Yeni Bəyaziddə 7, Sürməlidə 75, Eçmiədzində 84), Qars vilayətində 82 yaşayış məntəqəsi yerlə-yeksan edilib, 100 minlərlə əhali qırılıb və öz etnik ərazilərindən qaçqın düşüblər.

Tarix üzrə fəlsəfə doktoru, "Şərq" qəzetinin baş redaktoru Akif Aşırlı çıxış edərək elmi-tarixi faktlar əsasında hazırlanan təqdimatları yüksək dəyərləndirib. Bildirib ki, tarix yalnız keçmiş deyil, bu gündür, sabahdır, gələcəkdir. Biz tarixi faktlardan düzgün istifadə etməyi bacarmalı və tariximizdən layiqli ibrət dərsi almalıyıq.Akif Aşırlı çıxışında 31Mart soyqırımı zamanı milli mətbuat orqanlarımızın faciə ilə bağlı dərc etdikləri yazılar və xalqımızın tarixinin bu qanlı səhifələrinin ictimailəşdirilməsi istiqamətində həyata keçirdiyi fəaliyyət barədə ətraflı məlumat verib.

Tədbirdə yekun sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov ümummilli maraq kəsb edən mövzuya fərqli formada və yeni, yaradıcı üslubda yanaşılmasına görə təşkilatçılara təşəkkür edib. Rektor vurğulayıb ki, bu interaktiv dərs bir yaddaş dərsi, xatırlama dərsidir. Biz bir xalq, millət olaraq güclü olmalı, müstəqil dövlətimizi daha da qüdrətləndirməliyik. Ölkəmizdə sabitlik, qanunçuluq, iqtisadi inkişaf təmin edilib. Azərbaycan mühüm və böyük beynəlxalq layihələri uğurla həyata keçirir, ölkəmizin siyasi nüfuzu yüksəlir. Qarşıdan Prezident seçkisi gəlir. Biz seçkidə əmin-amanlığa, sabitliyə, tərəqqiyə, müasirliyə, ölkəmizin uğurlu gələcəyinə xidmət edən siyasətə səs verməli, Vətənimizi göz-bəbəyimiz kimi qorumalı, onun uğrunda əzmlə, fədakarlıqla çalışmalıyıq.

Sonda tələbələrə təqdimatlara görə sertifikatlar təqdim edilib.

**Nurlan Səmədov**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində seçkidə ilk dəfə səs verəcək gənclərlə görüş keçirilib



Martın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində seçkidə ilk dəfə səs verəcək gənclərlə görüş keçirilib. Tədbirdə fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının sədri, professor Himalay Qasımov, dekan müavini, dosent Allahyar İmanov, kafedra müdirləri və ilk dəfə seçkidə səs verəcək tələbələr iştirak ediblər.Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbiri giriş sözü ilə fakültənin dekanı Şəhla Əliyeva açaraq aprelin 11-də ölkəmizdə keçiriləcək Prezident seçkisi haqqında məlumat verib və tələbələrə seçkidə fəal olmağı tövsiyə edib. YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının sədri, professor Himalay Qasımov seçki haqqında ətraflı məruzə ilə çıxış edib və tələbələrin suallarını cavablandırıb. Sonra Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin fəaliyyəti ilə bağlı videoçarx nümayiş etdirilib.

Dekan müavini, dosent Allahyar İmanov, kafedra müdirləri, professor Ramiz Əliyev, professor Müseyib İlyasov,dosent Nailə Hüseynova , baş məllim Sədaqət Əliyeva, Tələbə Gənclər Təşkilatının (TGT) fakültə üzrə sədri Lamiyə Hacıyeva, "Pedaqoqlar" ərazi ilk təşkilatının fakültə üzrə sədr müavini Əsmər Tağıyeva maraqlı və məzmunlu çıxışları ilə tədbir iştirakçılarının diqqətini cəlb ediblər. Onlar öz çıxışlarında tələbələri Prezident seçkisində cənab İlham Əliyevə səs verməyə çağırıbar.

Fakültənin dekanı Şəhla Əliyeva bildirib ki, uzun illərdir YAP-ın üzvüdür və Prezidentin rəhbəri olduğu bu partiyaya ləyaqətlə və şərəflə xidmət etdiyi üçün qürur hissi keçirir. Azərbaycan Prezidenti gənclərə xüsusi diqqət və qayğı göstərir. Sonda isə "İlhamla irəli!" şüarını səsləndirərək seçkidə gəncləri cənab İlham Əliyevə səs verməyə çağırıb.



## Mir Cəlal Paşayev - 110

# Mir Cəlal nəsrinə metodoloji yanaşmanın yeni aspektləri

**Yazıçı-vətəndaş Mir Cəlal (1908- 1978) tanrısından güc alan, mənəvi təmkini uca tutan batin sima, XX əsr ictimai tarixi gerçəklər dönəmində ilkinliyini və özəlliyini qoruyub saxlayan fövqəlinsan idi.**

Mir Cəlal haqqında çox yazılmışdır. Aparılan tədqiqatlarda böyük sənətkarın yaradıcılığının mövzu, ideya və sənətkarlıq xüsusiyyətləri haqqında bu gün də öz müasirliyini saxlayan dəyərli fikirlər söylənmişdir. Mir Cəlalın bədii yaradıcılığı polifonik məzmuna və dərin məna potensiallarına malikdir. Təsadüfi deyil ki, müstəqillik dövrünün tədqiqatçıları da onun ədəbi-bədii irsinə çox həvəslə nüfuz edir, yaradıcılığının yeni-yeni sirlərini elmi təhlil müstəvisinə gətirirlər.Təyyar Salamoğlunun "Mir Cəlal nəsri və müasirlik (metodoloji münasibət kontekstində)" araşdırması məhz bu baxımdan diqqəti çəkir və ciddi elmi əhəmiyyət kəsb edir.

Təyyar Salamoğlu imzası elmi-ədəbi ictimaiyyətə və geniş oxucu kütləsinə yaxşı tanışdır.

Azərbaycan ədəbi-nəzəri fikrində "sovet" işarəsi ilə işarələndirilmiş bütün ədəbiyyatın yeganə dəyərləndirmə meyarı"nın "bədii mətnin özü" olması haqqında T.Salamoğlunun konsepsiya gerçəkləşdirməsi ədəbiyyatşünaslığımızda elmi həqiqət kimi artıq etiraf olunmaqdadır. "Mir Cəlalın bədii nəsri və müasirlik (metodoloji münasibət kontekstində)" adlı monoqrafik tədqiqat da (Bakı, "Orxan" NPM, 2018) bu konsepsiyanın gerçəkləşdirilməsi istiqamətində uğurlu bir addımdır. "Yenidən oxu" konseptini istər bədii, istərsə də ədəbi mətnlərə münasibətdə əsas yanaşma metoduna, dəyərləndirmə üsuluna çevirən Salamoğlu" (S.Rzasoy) Mir Cəlalın roman yaradıcılığını, xüsusən onun ilk üç romanını yeni metodoloji müstəvidə oxuyub, elmi təhlil obyektinə çevirə bilmişdir.




T.Salamoğlunun irəli sürdüyü əsas tezislərdən biri budur ki, Mir Cəlalın romanları zamanın axarında yazılmayıb, ona görə də zamanın axarında yazılmış romanlar kimi dəyərləndirilə bilməz. Tədqiqatçı "Bizim də zoşşenkolarımız olubmu?" adlı yazısında 30-40-cı illərdə ümumittifaq miqyasında gedən ədəbi prosesə nəzər salır, siyasi rejimin ədəbiyyat siyasətini, xüsusən UİK(b)P MK-nın məşhur 1946-1948-ci il qərarlarını geniş təhlil müstəvisinə çəkir və sübut edir ki, sözügedən illərdə SSRİ məkanda yaranan ədəbiyyatı birmənalı şəkildə ancaq sovet ideologiyasını əks etdirən əsərlər kimi qiymətləndirmək olmaz. Başqa sözlə, bu illərin ədəbiyyatı büsbütün sosrealizm çevrəsində olmayıb. Partiya qərarlarında adı çəkilən yazıçıların kəskin tənqid olunmasının səbəbi heç də onların əsərlərinin ideya-bədii zəifliyi olmayıb. Bu əsərlər ona görə tənqid olunub ki, sovet rejimini təbliğ etməyib, bədii inikasda milli və bəşəri dəyərləri əsas götürüblər, ədəbiyyatın immanent qanunlarına sədaqət nümayiş etdiriblər. T.Salamoğlu sübut edir ki, partiya qərarlarından sonra Mir Cəlalın yaradıcılığının kəskin tənqid hədəfinə çevrilməsi onun əsərlərinin antisovet ruhu ilə bağlı olub; "Bir gəncin manifesti"nin, "Açıq kitab"ın milli varlığın müstəmləkə rejiminə qarşı mübarizəsindən bəhs edən əsərlər kimi yazılması səbəb olub; "Dirilən adam"da milli məzmunun, bəşəri ideyanın "inqilab uğrunda mübarizə"nin fövqündə dayanması olub.

Tədqiqatçı "Bir gəncin manifesti"ni bizə öz şərti-metoforik məzmununda, pritçalar romanı kimi tədqim edir. Romanda altıncı və səkkizinci fəsillər kimi yer alan "Gecənin hökmü" və "İtə ataram, yada satmaram" adlı hissələri T.Salamoğlu bir-birinin məntiqi davamı olan və eyni zamanda tam müstəqil pritcalar kimi oxuyur. Məhz bu "oxu" prosesində romanda əks olunan tarixi dövrə - 1918-1919-cu illərdə doqquz aylıq zaman kəsiyində ingilislərin Azərbaycana müstəmləkəçi mudaxiləsini əks etdirən tarixi proseslərə yazıçının vətəndaş münasibəti aydınlaşır. T.Salamoğlu tarixi proseslərlə roman mətnini müqayisəli təhlilə cəlb edərək əsərdəki ingilis obrazlarının müstəmləkəçi rejimi simvollaşdırması məsələsini qoyur, hər iki pritçada ingilis- Sona qarşıdurmasını milli varlığın müstəmləkəçi rejimə müqavimət hərəkatını simvollaşdıran təsvirlər kimi izah edir. "İtə ataram, yada satmaram" pritçasında Sonanın milli varlığı müdafiə mövqeyinə hesablanmış hərəkətlərində ümumxalq dəstəyi və sevgisinin ifadəsi isə bütövlükdə xalqın müstəmləkə rejiminə qarşı mübarizə əzminin ifadəsi kimi dəyərləndirilir. Hər iki pritçanın əhatəli tədqiqi, Sonanın "mən Sona deyiləm, əgər bu ceyrana ingilis əli dəyə" andının, eyni zamanda, onun "itə ataram, yada satmaram" sözlərində ifadə olunan iradəsinin metaforik məzmununun təfsilatlı açılışı, Sona obrazı ilə Ç.Aytmatovun Nayman- ana obrazları arasında aparılan paralellər, Baharın acınacaqlı taleyinə humanist münasibətin ifadəsi və s. məsələlərə dair əsaslı təhlillər bizi tədqiqatçının roman haqqında son qənaətinə büsbütün şərik olmağa səsləyir: "Bir estetik kateqoriya olaraq biz tarixiliyin gücünü onun müasirliyində axtarırıq. İngilis işğalçı rejiminə milli varlığın müqavimət hərəkatını bütün incəliklərinə qədər bədii təhlilin mərkəzinə çəkəndə vətəndaş yazıçının Vətəni başqa bir işğalçı rejim altında idi. "Boz şeytan"ı "ağ ayı" əvəz etmişdi.

Mir Cəlalın qələmində milli şüura yeridilən işğalçılığa barışmaz münasibət ideyası vətən övladını yeni bir mücadilə meydanı açmağa, "ağ ayı" ilə mübarizəyə səfərbər edirdi. "Bir gəncin manifesti" bir də bitib-tükənməyən bu mübarizə pafosu ilə müasirdir".

Mir Cəlalın romanları arasında ən çox mübahisələrə səbəb olanı, büsbütün zidd mövqelərdən qiymətləndiriləni "Açıq kitab" olmuşdur.

Kitabda yer alan "Bizim də zoşşenkolarımız olubmu? və "Açıq kitab"ın açılmamış sirləri" yazılarında romanın zamanına görə açıqlana bilməyən mətləblərindən danışılır.

Tədqiqatçı "Açıq kitab"ı "zamanını qabaqlayan roman" adlandırır: "Məsələ burasındadır ki, təsvir predmetinə çevirdiyi həyat hadisələrinin obyektiv inikası və insan talelərinin önə çəkilməsi, başqa sözlə, humanist pafosu və idealı ilə "Açıq kitab" onunla eyni dövrdə yazılan romanlarla yox, ondan xeyli sonra yazılmış "Yanar ürək", "Yeraltı çaylar dənizə axır" və b.tipli digər əsərlərlə birləşir. Bu mənada "Açıq kitab" zamanı qabaqlayan bir romandır". T.Salamoğlu bu mövqeyini - "Açıq kitab"ı ondan 15-20 il sonra, siyasi yumşalma dövründə yazılan romanlarla eyni ideya mövqeyinə gətirməsini necə əsaslandırır?

"Yanar ürək", "Qara daşlar", "Yeraltı çaylar dənizə axır" və bu tipli digər romanlar siyasi yumşalma dövrünün imkanlarından isti-

(Davamı 8-ci səhifədə)

*Unutsaq, unudularıq!*

# 80 illik müəllim və alim ömrü

Bir əsrlik ənənəsi olan Azərbaycan Dövlət Pedaqoji Universiteti burada pedaqoji və elmi-pedaqoji fəaliyyət göstərən ziyalılarımızın zəkası, nuru, işığı ilə müqəddəs məbədə, "alma mater"ə çevrilib. Ömrünü millətin təhsili, maarifi və maarifçiliyi yolunda şam tək əridən belə müdrik insanlardan biri də dəyərli əməlləri, xeyirxahlığı, səmimiliyi, nəcib insani keyfiyyətləri ilə 18 yanvar 2018-ci ildə insanların yaddaşına köçən, xatirələrə çevrilən pedaqoji elmlər doktoru, professor, Əməkdar müəllim Seyidağa Sail oğlu Həmidovdur. O, 1938-ci ildə Azərbaycanın dilbər güşələrindən biri olan Lənkəran rayonunun Boladi kəndində anadan olmuşdur. Uşaqlıq illəri Böyük Vətən müharibəsinin ağır illərinə təsadüf etdiyindən mənsub olduğu nəslin qismətinə düşən acılı-şirinli günlərin hamısını yaşamalı olmuşdur. Milyonlarla ailələrə ölüm və fəlakət gətirən müharibə onların da qapısını döymüşdür. Atası Şimali Qafqaz cəbhəsində 1942-ci ilin fevral ayında gedən ağır döyüşlərdə həlak olmuşdur. Həyat yoldaşının "qara kağızı"nı alan Seyidağanın anası mehr və məhəbbətini oğluna salmış, onu atasına layiq böyütməyə çalışmışdır.



Maddi və mənəvi çətinliklərə baxmayaraq, Seyidağa Həmidov 1945-ci ildə Boladi kənd orta məktəbinin I sinfinə getmiş, elə ilk gündən fəhmi, diribaşlığı ilə fərqlənmişdir. 1955-ci ildə X sinfi "əla" qiymətlərlə bitirdikdən sonra arzularının qanadında Bakıya gəlmiş, V.İ.Lenin adına APİ-nin (indiki ADPU) Fizika-riyaziyyat fakültəsinə qəbul olunmuşdur. Çoxları kimi sadə tələbə həyatı yaşamış, vaxtının çoxunu kitabxanalarda oxuyub-öyrənməklə keçirmiş, gərgin zəhməti nəticəsində təhsil əlaçısı olmuş, tələbə yoldaşlarının və müəllimlərinin sevimlisinə çevrilmişdir. 1960-cı ildə APİ-ni müvəffəqiyyətlə bitirən Seyidağa Həmidov Bakının Qaradağ rayonunda müəllimlik fəaliyyətinə başlamışdır. O, Qaradağ rayonundakı 223, 166 və 233 nömrəli məktəblərdə fizika və riyaziyyat müəllimi işləməklə yanaşı, həm də APİ-nin Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasında saathesabı dərs demişdir. Elmi-pedaqoji işə maraq onu yenidən təhsil aldığı doğma instituta gətirmiş və 1966-cı ildə müsabiqə yolu ilə Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasında müəllim vəzifəsini tutmuşdur. Həmin kafedranın bazasında Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrası təşkil olunarkən Seyidağa Həmidov yeni yaradılan kafedraya köçürülmüşdür. Bu kafedra İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin (indiki İbtidai təhsil fakültəsi) nəzdində yaradılmışdı. Sonralar Seyidağa Həmidovun uzun illər rəhbəri olduğu həmin kafedraya o vaxtlar dosent Nüsrət Sadıxov rəhbərlik edirdi. Kafedranın 6 nəfər üzvündən biri də Seyidağa müəllim idi. O ilk gündən kafedrada həm yaxşı riyaziyyatçı, həm də yaxşı metodist kimi tanındı, təcrübəli müəllim kimi ad-san qazandı. Seyidağa müəllimin xoşbəxtliyi onda idi ki, o, orta məktəbdə Əməkdar müəllim Həmid Hüseynovdan, ali məktəbdə isə professor Bəylər Ağayevdən riyaziyyat elminin sirlərini dərindən öyrənmişdi. Elə bu səbəbdən də riyaziyyat elmi sahəsindəki axtarışları uğurla nəticələndi. 1972-ci ildə professor Bəylər Ağayevin rəhbərliyi altında "VII-VIII siniflərdə nəzəri hesab elementlərinin tədrisi metodikası" mövzusunda namizədlik dissertasiyası müdafiə etdi. Sonrakı illərdə tədqiqatının həm istiqaməti dəyişdi, həm də mündəricəsi xeyli zənginləşdi. Ümumtəhsil məktəblərinin ibtidai sinifləri üçün riyaziyyat dərsliklərinin rus dilindən tərcüməsində və nəşrə hazırlanmasında mühüm xidmətləri oldu. İbtidai siniflərdə riyaziyyatın məzmununun təkmilləşdirilməsi və gələcək ibtidai sinif müəllimlərinin riyazi hazırlığının nəzəri və praktik problemləri ilə bağlı ciddi elmi araşdırmalar apardı. 1992-ci ildə "Gələcək ibtidai sinif müəllimlərinin riyazi hazırlığının peşə-pedaqoji istiqaməti" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək pedaqoji elmlər doktoru elmi dərəcəsi aldı. İki il sonra ona professor elmi adı verildi. İbtidai siniflərdə riyaziyyatın tədrisi metodikası sahəsində ilk və hələlik son elmlər doktoru oldu. Elmi-nəzəri və praktik dəyərliliyi ilə seçilən dissertasiyada aşağıdakı məsələlər öz əksini tapmışdı:1)pedaqoji fakültə tələbələrinin riyazi hazırlığının məzmunu və onun təkmilləşdirilməsi (yeni mövzuların daxil edilməsi, o cümlədən ədədlər nəzəriyyəsi elementlərinin gücləndirilməsi, praktik məşğələlərdə məsələ həllinə diqqətin artırılması və s.); 2)riyaziyyatın tədrisi metodikası fənninin həcmi və məzmununun təkmilləşdirilməsi, müasir təlim metodlarından istifadə olunması; 3)tələbələrin riyazi-tədqiqat işlərinə və tədris-tədqiqat işlərinə cəlb olunması; 4)tələbələrin pedaqoji təcrübəsinin müasir tələblərə uyğun təşkili və həyata keçirilməsi; 5)pedaqoji fakültədə riyaziyyatın tədrisinin təşkili formalarının təkmilləşdirilməsi.

Dissertasiyada irəli sürdüyü ideyaların, təklif və tövsiyələrin əsas hissəsi onun "Müqayisə nəzəriyyəsi elementlərinin riyazi isbat və hesablamalara tətbiqi" (1984), "Elementar riyazi təsəvvürlərin formalaşdırılması kursunun nəzəri əsasları" (1987), "Uşaqlarda elementar riyazi təsəvvürlərin formalaşdırılması metodikası" (1988), "Pedaqoji fakültədə riyaziyyatın tədrisi metodikası" (1990) "Riyaziyyatın tədrisi metodikası (I-IV siniflər)" (1994), "Həndəsədən didaktik materiallar" (1994), "Riyaziyyatın tədrisi metodikası ( I-IV siniflər)" (1997), "Riyaziyyatdan məsələ və misallar" (1983), "Riyaziyyatın tədrisi metodikası" (2001), "İbtidai siniflərdə məsələ həlli təliminin aktual problemləri" (2008) adlı dərslik və dərs vəsaitlərində, respublikanın və xarici ölkələrin nüfuzlu elmi jurnallarında nəşr olunmuş 200-dən çox elmi və metodik məqalədə öz əksini tapdı.

Alimin Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasına rəhbərliyi dövründə kafedra elmi məktəbə çevrildi. Riyazi təhsilin nəzəri və metodiki problemlərinin tədqiqi sahəsində araşdırmalar intensivləşdi. Ümumtəhsil məktəblərinin riyaziyyat müəllimləri ilə əlaqələri genişləndi. Onların iştirakı ilə ibtidai siniflərdə riyaziyyat fənninin tədrisi və "Riyaziyyat" dərsliklərinin təkmilləşdirilməsi ilə bağlı elmi seminarlar, dəyirmi masalar keçirildi. O, Təhsil Nazirliyində, Dövlət İmtahan Mərkəzində, koordinasiya, dissertasiya və elmi-metodiki şuralarda ibtidai siniflərdə riyaziyyatın tədrisi ilə bağlı səlahiyyətli söz sahibi kimi tanındı. Qısa bir vaxtda ibtidai siniflərdə riyaziyyatın tədrisinin tarixi, təbliği və təkmilləşdiriməsi sahəsində elmi məktəb yaratdı. Bakı, Moskva, Kiyev, Xarkov, Riqa, Tbilisi şəhərlərində keçirilən konfranslarda və elmi seminarlarda həmkarlarının marağına səbəb olan məruzələrlə çıxış etdi. "Riyaziyyatın tədrisi metodikası" ixtisası üzrə 18 nəfərin fəlsəfə doktoru dissertasiyasına rəhbərlik etdi. Ümumiyyətlə, "Riyaziyyatın tədrisi metodikası" ixtisası üzrə fəlsəfə və elmlər doktoru dissertasiyası müdafiə edənlərin alim kimi yetişməsində onun mühüm əməyi var. Belə ki, o, elmi rəhbər, rəsmi opponent, dissertasiya şurasının və ya Ali Attestasiya Komissiyasının (AAK) ekspert komissiyasının üzvü kimi həmişə doktorantların xeyirxahı olub. Respublikada riyaziyyatın ibtidai kursunun məzmununun təkmilləşdirilməsi, nəzəri və praktik istiqamətlərinin araşdırılması, proqram, dərslik və dərs vəsaitlərinin hazırlanması, bu sahədə magistr və elmi-pedaqoji kadrların hazırlanması onun adı və fəaliyyəti ilə bağlı olmuşdur. Seyidağa müəllim hələ tələbəlik illərində institutda fəaliyyət göstərən riyaziyyat dərnəyinin fəal üzvlərindən olmuş, pedaqoji mətbuatda maraqlı məqalələrlə çıxış etmişdir. Alimin riyaziyyatın tədrisi metodikasına aid ilk məqalələri 1958-1960-cı illərə təsadüf edir. Onun hələ orta məktəbdə müəllim işlədiyi illərdə təcrübəsi ilə bağlı "Fizika və riyaziyyatın tədrisi" jurnalında metodiki məqalələri yer alıb. İnstitutda elmi-pedaqoji fəaliyyətə başladığı ilk illərdən isə məhsuldar yaradıcılığı ilə həmkarlarından seçilmiş, həm respublikanın, həm də keçmiş İttifaqın elmi nəşrlərində elmi-metodik məqalələrlə müntəzəm çıxış etmişdir. Onun "Naçalnaya şkola" və "Matematika v şkole" jurnallarında çap olunmuş məqalələri indi də aktuallığı ilə diqqəti cəlb edir.

Professor Seyidağa Həmidov universitetimizin elmi-pedaqoji və ictimai həyatında fəal iştirak etmişdir. Seyidağa müəllim Pedaqoji fakültənin (indiki İbtidai təhsil fakültəsinin) həmkarlar təşkilatının sədri, ilk partiya təşkilatının katibi, universitet Elmi Şurasının elmi katibi (1994-2000), "Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi" ixtisası üzrə Dissertasiya Şurasının elmi katibi (2000-2005), AAK-da ekspert şurasının elmi katibi (1995-2000-ci illər) vəzifələrində çalışmışdır. O, 1973-cü ildən ömrünün sonuna kimi fəlsəfə və elmlər doktoru dissertasiyalarının müdafiə şuralarının üzvü olmuşdur.

Professor S.Həmidovun şəxsiyyəti, pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı fəaliyyəti həmişə yüksək qiymətləndirilmişdir. 2006-cı ildə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə "Əməkdar müəllim" fəxri adına və 2010-cu ildə Təhsil Nazirliyinin "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanına layiq görülmüşdür. Ayrı-ayrı vaxtlarda Təhsil Nazirliyinin, Pedaqoji Universitetin fəxri fərmanları və diplomları ilə təltif olunmuşdur.

Seyidağa müəllim örnək insan idi. Universitetdə hamının, xüsusilə tələbələrin sevimlisi idi. Mən onu 1978-ci ildən tanıyırdım, ali məktəbdə müəllimim olmuşdu. Bir dəfə də olsun əsəbləşdiyini, səsini ucaltdığını hiss etməmişəm. 10 il eyni fakültədə o, kafedra müdiri, mən dekan işləmişəm. Fakültənin ağsaqqalı kimi həmişə dəyərli məsləhətlərini, tövsiyələrini eşitmişəm. Seyidağa müəllim zəhmətsevər, dostluqda sədaqətli, sözündə bütöv, yüksək əxlaq və fəzilət sahibi idi. Zəngin və geniş erudisiyası, ədalətliliyi, humanistliyi, sakit təbiəti ilə seçilirdi. Ruhi müvazinətini heç vaxt itirməzdi. Bütün varlığı ilə Yaradana bağlı idi. Səbrli və dözümlü, özünə hörmət edən, öz şəxsiyyətini qoruyan, təvazökar insan idi. Ömür yolu hamar və rahat olmamışdı. O, tale kitabının hər səhifəsini zəhmətlə, əziyyətlə, ən başlıcası isə halallıqla yazmışdı. Mənəvi saflıq, insanlara sonsuz məhəbbət, xeyirxahlıq onu ucalığa aparan yolun əsas bələdçisi olmuşdu. Sevimli müəllimim, xeyirxah məsləhətçim Seyidağa müəllim haqqında keçmiş zamanda danışmaq və yazmaq mənim üçün çox ağırdır. Amma nə etməli? Onun haqq dünyasına qovuşmasını qəbul etməkdən başqa yolumuz yoxdur. Təsəllimiz odur ki, əziz müəllimimiz 80 il mənalı, şərəfli, ləyaqətli və layiqli müəllim və alim ömrü yaşadı. Allah rəhmət eləsin.

**Fərrux Rüstəmov,**
**İbtidai təhsil fakültəsinin dekanı,**
**pedaqogika üzrə elmlər doktoru, professor,**
**Əməkdar elm xadimi**

*Mir Cəlal Paşayev - 110*

# Mir Cəlal nəsrinə metodoloji yanaşmanın yeni aspektləri

(Əvvəli 7-ci səhifədə)

fadə edib sovet rejiminə məxsus eybəcərlikləri təhlil müstəvisinə çəkə bilmişdilər. T.Salamoğlu əsaslandırır ki, İ.Hüseynov, M.Hüseyn və b.siyasi yumşalma dövründə ortaya qoyduqları estetik mövqeyi Mir Cəlal "Açıq kitab"da 1941-ci ildə gerçəkləşdirmişdi. T.Salamoğlu Gəldiyev obrazının, "gəldiyevçilik"in tam fərqli - şərti-metaforik məzmununu açır: "Açıq kitab" romanının satirik qəhrəmanı bu mühitdən (sovet rejimi mühitindən - H.Q.) güc alan və onun xarakterini ifadə edən bir obraz kimi yaradılmışdır... Mir Cəlal Kərim Gəldiyevi fərdi xarakterin ümumiləşdirilmiş obrazı kimi yaratmayıb. Onun simasında siyasi rejimin "mənəvi dünyası"nı əks etdirib. Kərim Gəldiyev şərti-metoforik obrazdır. Zamanın xisləti Kərim Gəldiyevin üzərinə köçürülüb". Bu mülahizələrdən sonra T.Salamoğlu Zamanın Kərim Gəldiyevin üzərinə köçürülən xislətinin əlamətdar keyfiyyətlərini sıralayır. Bu sıralanmada sovet rejiminin milli varlığa münasibətinin müstəmləkəçi xarakteri bütünlükdə əks olunur. T.Salamoğlu iddia edir ki, sovet rejiminə kəskin tənqidi münasibətlərin tarixi 50-ci illərin ortalarından yox, elə 30-40-cı illərdən başlayır. Bu isə o deməkdir ki, alim belə bir mövqe üzərində israr edir ki, 20-ci illərdən 50-ci illərin ortalarına qədərki milli ədəbiyyatı büsbütün "sosrealizm çevrəsində" təsəvvür etmək heç də özünü doğrultmur.

T.Salamoğlu irəli atdığı fikri, müdafiə etdiyi konsepsiyanı axıra qədər əsaslandırmağı bacaran və təhlillərində mübahisə üçün yer qoymamağa çalışan bir tədqiqatçıdır. Onun "Açıq kitab"ın bədii konflikti ilə bağlı irəli sürdüyü mülahizələr də bu baxımdan olduqca səciyyəvidir. Bu mülahizələr ədəbiyyatşünaslığımız üçün tamamilə yenidir. Tədqiqatçı belə bir mövqedədir ki, "romanın konflikti Vahid-Rübabə cütlüyü ilə Kərim Gəldiyevin arasındakı ziddiyyətlər əsasında inkişaf edir". Yəni Gəldiyevi sovet rejimini metaforalaşdıran obraz kimi təsəvvür edən tədqiqatçı Vahid-Rübabə cütlüyündə milli varlığın bədii təcəssümünü görür. Beləliklə, T.Salamoğlu Vahid-Rübabə cütlüyü ilə Gəldiyev arasındakı ziddiyyətləri, çarpışmaları milli varlığın sovet rejiminə qarşı müqavimət hərəkatı kimi mənalandırır. Vahidlə Rübabə obrazlarının "son dərəcə zəif, sönük" çıxması ilə bağlı tənqiddə səslənən fikirləri qəbul etməyən alim onların daşıdığı estetik funksiya ilə bağlı təkzib edilməsi çətin olan əsaslı arqumentlər irəli sürür: "Nə Rübabə, nə də Vahid "zəif, sönük xarakterlər" deyil, gücsüzdürlər. Bu obrazların yaradılmasında da yazıçının həyat həqiqətinə sədaqəti bütün çılpaqlığı ilə görünür. Müəllif onları "şişirdilmiş müsbət qəhrəman"lar kimi təqdim etmək fikrindən uzaqdır. Zamanın günü-gündən dəyişən xarakteri Vahidin və Rübabənin xeyrinə deyil. Milli tarixi varlıqdan gələn , Vahidin və Rübabənin xarakterində cəmləşən keyfiyyətlər onların yaşadıqları zamanda təqdir olunmur. Buna görə də onlar getdikcə daha artıq gücsüzləşir və tragik bir həyat yaşamağa məhkum olunurlar".

Ədəbiyyatşünaslığımız müasir Azərbaycan ədəbiyyatında yeni keyfiyyət mərhələsinə keçidin başlanğıcını 50-ci illərin ortalarına aid edir. Bu zaman keçidi şərtləndirən əsas əlamətlər sırasında ədəbiyyatımızda insan amilinin, şəxsiyyət başlanğıcının önə keçməsi əsas götürülür. Lakin T.Salamoğlunun Mir Cəlalla bağlı tədqiqatları 20-50-ci illərin ədəbiyyatını insan amilindən, şəxsiyyət başlanğıcından sərt-nəzər etmək fikrinə tənqidi yanaşma təlqin edir. Onun "Dirilən adam"la bağlı araşdırmaları ədəbiyyatımızda hətta repressiya dövrünün ərəfəsində belə insan amilinin, insana humanist münasibətin konseptual qoyuluşundan xəbər verir.

Tədqiqatçı O.Balzakın "Polkovnik Şaber" və Mir Cəlalın "Dirilən adam" əsərlərini müqayisəli təhlilə cəlb edərək belə qənaətə gəlir ki, "hansı zamanda və şəraitdə yaşamasından asılı olmayaraq ölməmiş insanın öz sağlığını sübut edə bilməməsinin təsviri insana qeyri-humanist münasibəti tənqid kontekstini önə çıxarır". Salamoğlu düşünür ki, XIX əsrin dahi tənqidi realistinin də, XX əsrin sosrealistinin də "dirilən adam" süjetinə verdiyi bədii həll insana qeyri-insani münasibətinə görə ictimai mühiti, sosial - siyasi şəraiti kəskin tənqidə istiqamətlənir. Mir Cəlaın "Dirilən adam" mövzusuna verdiyi bədii həll onu Balzak realizminin varisinə çevirməklə, sənətkarı sosrealizm çevrəsindən çıxaran əsas metodoloji keyfiyyət statusu qazanır. Tədqiqatçıya görə, Mir Cəlalın yaradıcılığının sonrakı mərhələlərində də, xüsusən "Bir gəncin manifesti" və "Açıq kitab"da bədii əksetdirmədə insan amilini davamlı keyfiyyətə çevirməsi bu romanların hər üçünü "İnsanlığın manifesti kimi yaşayan romanlar" kimi xarakterizə etməyə imkan verməklə onun yazıçı üslubunun dominantı kimi çıxış edir.

Professor T.Salamoğlunun "Mir Cəlal nəsri və müasirlik (metodoloji münasibət kontekstində)" adlı bu əsəri anadan olmasının 110 illiyi ərəfəsində böyük yazıçının yaradıcılığına münasibətin tam yeni elmi və metodoloji aspektlərini üzə çıxaran tədqiqat kimi mühüm dəyərə malikdir. Düşünürük ki, bu monoqrafik araşdırma ədəbi-elmi ictimaiyyətin dərin marağına səbəb olacaqdır.

**Himalay Qasımov,**
**professor**

# ADPU-nun Quba Filialında Novruz bayramı

Martın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında milli adət-ənənələri özündə əks etdirən Novruz bayramı münasibətilə müsabiqə keçirilib. Müsabiqədə filialın tələbələri müxtəlif əl işlərindən ibarət xonçalar, rəsm əsərləri, maraqlı yaradıcılıq nümunələri ilə iştirak ediblər.

Müsabiqənin qalibi filialın "İbtidai sinif müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Emin Tahayev olub. Emin Tahayevin Novruz elementləri ilə qələmə aldığı "ADPU Quba Filialı" yazısı iştirakçıların marağına səbəb olub.



Sonda filialın kollektivi Quba şəhər Meydanında keçirilən ümumrayon tədbirində iştirak edib.

# ADPU-nun Cəlilabad Filialında Novruz bayramına həsr olunmuş tədbir

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında Novruz bayramına həsr olunmuş tədbir keçirilib. Tədbirdə filialın direktoru, dosent Xudayar Sultanlı, kafedra müdirləri, müəllimlər, filialın əməkdaşları və tələbələri iştirak ediblər.



Filialın direktoru, dosent Xudayar Sultanlı iştirakçıları bayram münasibətilə təbrik edib, onlara xoş bayram arzularını bildirib. Qeyd edib ki, ata-babalarımızdan bizə yadigar qalan milli adət-ənənələrimizi özündə təzahür etdirən Novruz bayramı xalqımızın ən əziz bayramıdır.

Tədbirdə xalqımızın hər il böyük coşqu ilə qeyd etdiyi Novruz bayramının tarixi, ənənələri, rəmzləri haqqında məlumat verilib. Novruzun rəmzləri sayılan Bahar qız, Kosa və Keçəl, tələbələrin ifasında səslənən şən mahnılar, səhnəciklər, bayram ovqatlı şeirlər tədbirə rəngarənglik qatıb.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Möhbalıyevaya, əmisi

**Faiq Möhbalıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Təranə Sadıqovaya, atası

**Buta Sadıqovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının dosenti Şuriyyə Azadəliyevaya, anası

**Şahxanım xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti Zakir Kərimova, oğlu

**Vüsal Kərimovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 983
Sayı: 1500
Çapa imzalanıb: 30.03.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.